AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ adına ƏLYAZMALAR İNSTİTUTU

HACI HƏSƏN HÜSEYNİ

# NOVRUZ BAYRAMI

Kitab Şah İsmayıl Xətainin
535 illik yubileyinə ithafdır

BAKI-2022

***AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi şurasının 12 fevral 2022-ci il tarixli (2 saylı) iclasının qərarı ilə çap olunur.***

Nəşrə hazırlayan
və ön söz müəllifi:
**SONA XƏYAL**
Redaktor:
**RAUF İLYASOĞLU**
Rəyçilər:
**HACI SOLTAN ƏLİZADƏ**
islamşünas, tədqiqatçı
**TAHİRƏ HƏSƏNZADƏ**
tarix elmləri doktoru
**SAMİRƏ ƏLİYEVA**
filologiya üzrə fəlsəfə doktoru

Hacı Həsən Hüseyni. Novruz bayramı. Bakı-2022.
144 səh.

Kitabda islamşünas, tədqiqatçı, publisist, I qrup Qarabağ əlili Hacı Həsən Hüseyninin uzun illər bayramlarla bağlı apardığı tədqiqat işlərinin bir hissəsi təqdim olunmuşdur. Yazılarda Novruz bayramı, Xıdır nəbi bayramı və s. haqqında məlumatlar verilmişdir. Bir sıra alimlərin, tədqiqatçıların və şairlərin əsərlərinə müraciət edən müəllif yeri gəldikcə onların fikirlərini diqqətə çatdırmış və müqayisəli şəkildə öz fikirlərini təqdim etmişdir.

# ƏN GÖZƏL BAYRAMIMIZ

On-on beş il əvvəl "Ədəbiyyat qəzeti"ndə şərqşünas Aida İmanquliyevanın Novruz bayramı ilə bağlı geniş bir məqaləsinin təkrar nəşrini oxumuşdum. Bu mənim Novruzla bağlı oxuduğum ən əhatəli və sanballı məqalə idi. Müəllif Novruz bayramının, səhv etmirəmsə, VII və ya VIII əsrdə İranda yarandığını bildirmiş, tarixi faktlara söykənərək, dəyərli fikirlər söyləmiş, hətta İran taxtına çıxan hansı padşahınsa öz dövründə bu bayramın keçirilməsini qadağan etdiyini də diqqətə çatdırmışdır. O zaman mən də həmin padşahın əhli-sünnə olduğu üçün bu qadağanı tətbiq etdiyini düşünmüşdüm. Haçansa Novruzla bağlı bir kitab yazmağı planlaşdırmışdım, amma bu barədə çox yazıldığını və təzadlı fikirlərin səsləndirildiyini gördükdə bu fikrimi gerçəkləşdirməkdən vaz keçmişdim.

Mən hələ uşaq ikən nənəmdən bayram haqqında sual etdikdə, "Həzrəti-Əli (ə) taxta çıxıb, onu bayram edirik" cavabını almışdım. Lakin böyüdükcə, bayramın dini bayram çərçivəsindən çox-çox kənarlaşdığı, Novruzun tarixinin daha qədimlərə gedib çıxdığı qənaətinə gəldim. Araşdırmalar apardıqda isə, müxtəlif yollar ayrıcında qaldım.

Novruz bayramının iki ən qabarıq atributu var: səməni və tonqal. Tonqalı düşünəndə, fikir gedib atəşpərəstlərə dayanırsa, səmənini düşünəndə daha çox uzaqlara gedib çıxırıq. Professor Azad Nəbiyev "Azərbaycan-özbək folklor əlaqələri" adlı kitabında folklor əlaqələrindən bəhs edərkən mövsüm nəğmələrindən də söz açır və Novruz bayramı ilə əlaqədar müxtəlif alimlərin fikirlərini qeyd edərək yazır: "Bir çoxları bu mərasimi islam, bəziləri isə hətta zərdüştliklə bağlamışlar. Hələ 1913-cü ildə T.Bayraməlibəyov yazırdı: "...Bahar bayramı olan Novruz atəşpə-

rəstliyin banisi Zərdüştün adı ilə bağlıdır". Eyni müddəaya tərəfdar çıxan A.O.Makovelski isə bu mərasimdən bəhs edərkən göstərirdi ki, Zərdüşt tövsiyə edirdi ki, sədəqələr və qurbanlar verməkdən taxıl əkmək, bol məhsul əldə etmək daha vacibdir. Abdulla Şaiq isə "Xatirələr"ində yazırdı: "Novruz bayramı günlərində keçirilən bir çox mərasimlər atəşpərəstlərin adətləri ilə əlaqədardır".

Həmin məsələ ətrafında aparılan digər tədqiqatlarda da Novruz atəşpərəstliklə əlaqələndirilir. Lakin bu mülahizələrə onu da əlavə etmək lazımdır ki, ibtidai dinlərdən olan atəşpərəstliyin özünə qədər də xalq içərisində baharın gəlişinə sevinən, təbiətin oyanmasını alqışlayan bu mərasim mövcud olmuş, atəşpərəstlik dövründə Zərdüşt tərəfindən rəğbətlə qarşılanan həmin mərasim yeni çalarlarla zənginləşdirilmişdir. Tonqal qalamaq, od üzərindən atlanmaq və s. kimi ənənələr bilavasitə atəşpərəstliyin təsiri, Novruzu təntənəli keçirmək arzuları ilə bağlı olmuşdur..." (Yazıçı, 1978, s.74). Müəllimimizin ruhuna hörmətlə fikirlərini qəbul edir, lakin əlavə etmək istərdik ki, bu bayram Novruz adına qədər müxtəlif zamanlarda, müxtəlif məkanlarda, müxtəlif adətlərlə zənginləşdirilmiş, hər millət özünə uyğun olanı götürmüş, uyğun olmayanı atmış və öz adətlərini əlavə etmiş və bugünkü Novruz bayramı yaranmışdır. Ona görə Novruzu kimlərsə bahar bayramı, kimlərsə atəşpərəstlik bayramı kimi, kimlərsə də Həzrəti-Əlinin (ə) taxta çıxdığı gün kimi qeyd edə bilər və edir də...

Novruzun tonqal məsələsinə gəlincə, əslində bu od yandırmaq deyil, köhnə paltarları, yəni əski-üskünü yandırmaq üşündür. Bizdə deyilən "üskü" sözü də buradan qalmışdır. Biz atəşpərəstlər kimi oda xatir tonqal qalamırıq, sadəcə əski-üskünü yandırır, əvəzində təzə paltarlar geyinirik və il boyu üstümüzə çökən ağırlığın köhnə paltarların

yanması ilə getdiyinə inanırıq. Biz uşaq vaxtından belə görmüşük, tonqal qalamaq, taxta, bəzən təkər və müxtəlif köhnə şeylər yandırmaq sonradan dəbə düşmüşdür. Əgər başqa xalqların yeni ilinə nəzər salsaq, görərik ki, çoxunda, bəlkə hamısında müxtəlif vasitələrlə köhnə əşyalardan qurtulmaq məsələsi vardır. Azad müəllim fikrini səməniyə gətirib çıxarır və çox haqlı olaraq, bu adətin Zərdüştilikdən çox-çox əvvəl olduğunu vurğulayır. Təbii ki, Allahtəala yaratdığı ilk insanları təbiətin qoynuna göndərmişdi. Yer əvvəllər su ilə əhatə edilmiş, sonra ilk cücərtilər, otlar, kollar, ağaclar yaranmış, yəni Allah insanı göndərəndə artıq onun yaşaması üçün təbii yeməklər, ən azından otlar var idi. Bəzi tədqiqatçılar Yeni günün məhz elə bu gün olduğunu təxmin edirlər. Amma yeni günün olması üçün, ondan əvvəl köhnəsi olmalıdır. Ona görə də ilkin Yeni günün Nuhun gəmisinin quruya çıxdığı gün olduğu qənaətindəyik. Amma yeni gün bununla bitmir, tarixə baxanda Allahın bu müqəddəs gündə bir çox tarixləri müqəddəsləşdirdiyinin şahidi oluruq. Ona görə də təkcə bir millət deyil, bir çox millətlər Yeni günü bayram edə bilərlər.

Bizim hər il milli bayram kimi qeyd etdiyimiz Novruz bayramının adına gəlincə, hamının bildiyi kimi bayramın adı fars sözündəndir və bu bayram Novruz adı ilə Aida İmanquliyevanın yazdığı kimi ilk dəfə İranda qeyd olunmuşdur. Cavad Heyət də “Azərbaycan şifahi xalq ədəbiyyatı” adlı kitabında yazır: “Mövsüm mərasimləri də əskidən insanların etiqadları, təbiət hadisələrinə qarşı münasibətləri və əmək fəaliyyəti ilə əlaqədar düzəlmişdir. Əkinçilik, maldarlıq, ovçuluq və bu kimi işlərlə də bağlı olaraq mərasimlər təşkil edilmişdir. Mövsüm mərasimləri içərisində ən çox yayılanı yeni il – Novruz mərasimidir. Novruz mərasimi qışın bitməsi və baharın gəlməsi ilə başlanır.

Bu bayram insanlara sevinc və ümid verən və onları ruhlandıran bir bayramdır. Belə nəzərə gəlir ki, bu bayram əski iranlılardan türklərə keçmişdir. Bu bayramda müxtəlif mahnılar oxunur və bayrama məxsus mərasimlər yerinə yetirilir" (Azərbaycan Dövlət nəşriyyatı, 1990, s.132-133).

Novruzun istər İranda hansı şahınsa zamanında, istərsə də Azərbaycanda sovet dönəmində qadağalara məruz qalması onun dini çalarını özündə qoruyub saxlayır. Tarixə görə Həzrəti-Əlinin (ə) xəlifəliyə gəldiyi gün də Novruz bayramına düşmüşdür. Bəlkə də Novruzun uzunömürlü bayram olmasında bunun böyük rolu olmuşdur. Bəzən deyirlər biz türk millətiyik, Novruz da milli bayramdır, elə isə niyə Türkiyədə bu bayram milli bayram kimi qeyd olunmur? Əgər bu bahar bayramıdırsa, bahar hər ölkəyə gəlir, niyə hər yerdə Novruz kimi qeyd olunmur? Bu sualların cavabı aydındır... Novruz beynəlxalq bahar bayramıdır. Növruz Azərbaycanın milli bayramıdır. Biz sorağı çox-çox qədimlərə gedib çıxan, müxtəlif zamanlarda müxtəlif adlar daşıyan Yeni gün haqqında danışırıq. Altaylıların Ayzıt bayramından tutmuş, sovet dönəmində Şıxəli Qurbanovun Bahar bayramı adlandırdığı Yeni gün haqqında. Professor Kamil Vəliyev "Elin yaddaşı, dilin yaddaşı" adlı kitabında yazır: "Ayzıt bayramı Altaylıların gözəllik tanrısı Ayzıta həsr etdikləri bayram idi. Bayram yazın əvvəllərində meşələrdə keçirilirdi. Bayramı ağ şamanlar idarə edirdi. Qadınlar bu bayramda iştirak etməzdilər. Qışda isə bu bayram evdə qadınların iştirakı ilə keçirilirdi, bayramı qara şamanlar idarə edirdi. Şamanlara bu adlar paltarın rənginə görə verilirdi. Bayram günləri evlər təmizlənir, bəzədilir, ən yaxşı yeməklər bişirilir, ən gözəl paltarlar geyilirdi" ("Gənclik", 1987, s. 56). Yazı belə düşünməyə imkan verir ki, qışda qadınların keçirdiyi bay-

ram, əslində yazda kişilərin keçirəcəyi bayramın hazırlıq mərhələsidir...

Novruzdan əvvəl Xızır peyğəmbərlə bağlı "Xıdır nəbi" bayramı da qeyd edilir ki, burada da həyatın yenilənməsi məsələsi vardır. Dirilk suyu içib ölümsüzlük qazanan Xızırın xatirinə qeyd olunan bayramın bir sıra adətləri də Ayzit və Novruzla çox oxşardır. Professor Mirəli Seyidov "Yaz bayramı" adlı kitabında "Kosa-kosa"dan, "Qodu-qodu"dan söz açarkən, Kosanı qışın, indi Keçəl kimi təqdim olunan keçini isə yazın rəmzi hesab edir və sonda Keçinin Kosanı vurub öldürməsini baharın qış üzərində qalibiyyəti kimi verir. Onun yazdığına görə, "Kosam ikicanlıdır" ifadəsi əslində qışın bahara hamilə olmasıdır: "Yaz qışdan doğulur. Qış istəsə də, istəməsə də bu "uşaq" – yaz doğulmalıdır. Xalq təfəkküründə mövcud an, qırpım gələcək, onu izləyən anı, öz qənimini bətnində böyüdür. Mövcud anın bətnindəki an, qırpım həyatın dialektikasıdır, həyat deməkdir. O, vaxtı, həyatı irəli aparır. Mövcud anla doğulan anın arasındakı qırpım vaxtdır. Bu əski türk xalqlarının təbiətdən gələn, ondan doğulan dialektikasıdır. Qışın doğacağı "uşaq" – yaz əkinçiliklə, maldarlıqla məşğul olanlar üçün həyat idi. Xalq məişətlə, təsərrüfatla ilişgili olduğuna görə yazın istisini – Xızırı çağırır və istini Xızı gətirməsini xahiş edir..." ("Gənclik", 1990, s. 29).

Xıdır nəbi ilə Novruz bayramları arasında o qədər böyük zaman məsafəsi də yoxdur. Bu, bizim əsas çərşənbələrdən əvvəl yalançı çərşənbə (oğru üskü) dediyimiz zamana təsadüf edir. El arasında "Oğru üskü yerə dəydi, daha yazdır, qış bitər, torpaq qızar" deyimini həmişə eşitmişik. Bəlkə elə vaxtilə Novruz bayramı müxtəlif bölgələrdə bu ad altında keçirilmişdir. Çünki hər iki bayram qışın yerini bahara verməsi ərəfəsində qeyd olunur. Qışın "alaçar-

pa və ya boz ay" adlandırılan son ayında həftədən-həftəyə hava dəyişir. Getdikcə günəşin hərarətinin artması ilə torpaq qızır, sanki yatmış təbiət oyanır. Hər həftənin çərşənbəsi öz adıyla gəlir, "işini görür", hər həftə təbiətin bir az da dirildiyinin şahidi oluruq. Professor Vaqif Vəliyev "Azərbaycan folkloru" kitabında Novruz haqqında Əfsanə və rəvayətlərdən bəhs edir, hətta Nizaminin "İskəndərnamə"sınə belə müraciət edir, tonqal qalamağın, şam yandırmağın qədim adətlərimizdən olduğunu vurğulayır, süfrəyə 7 çür meyvə qurusu qoyulduğunu bildirir və danatma mərasimi qeyd edir: "Axırıncı çərşənbə gecəsi xalq arasında Novruz bayramının ən əziz dəqiqələri hesab olunurdu. Bu mərasim Novruz bayramının başlanğıcı deməkdir. Qədim əcdadlarımız baharın qış üzərində qələbəsinə, xeyrin şərə, Hörmüzün Əhrimənə qalib gəlməsi kimi baxmışlar. Ona görə də qışın son dəqiqəsi, yəni onun məğlubiyyəti, baharın isə qalib kimi dünyaya hakim olması böyük şənliklə qarşılanmışdır. Xalq bu mərasimə "Danatma" adı vermişdir" ("Maarif", 1985, s. 95).

Novruz həm də təqvim ilinin yenilənməsi kimi qeyd edilir. Hicri-şəmsi təqviminə görə Novruz bayramında köhnə il təhvil olur, yeni il gəlir. Əvvəllər Novruz bayramı martın 8-də keçirilirdi. Hətta hansı orta məktəb dərsliyində oxuduğum bir şeirin ilk iki misrası da yadımdadır:

Gəldi martın doqquzu,
Bayram etdik Novruzu.

Əlyazmalar İntitutunda Əliabbas Müznibin arxivində qardaşı Əmin Abidin bir əlyazması da belə başlayır: "Matrın doqquzu Novruz bayramının ikinci günü səhər evdən çıxdım...". Sonralar təqvim 13 gün yerini dəyişdiyindən,

tarix dəyişmişdir. Göründüyü kimi, yanvarın biri olduğu kimi saxlanılmış, ruslar yanvarın 13-də köhnə yeni ili təkrar qeyd edirlər. Lakin Novruz bayramı günü əsas götürülmüş, tarix 13 gün sonraya keçirilmişdir. Bu da həmin bayramın müqəddəs gün olmasının bir sübutudur. Bu sadəcə bahar bayramı olsaydı, yəqin ki, 8 mart tarixi saxlanılardı. Amma yeni təqvim ili martın 20-21-də dəyişir və bəzi ölkələr bu təqvimlə işləyir. Bəzi ölkələrdə Novruz həm dini bayramdır, həm də bahar bayramı kimi keçirlir. Göründüyü kimi, Novruz haqqında fikirlər çoxdur və hamı da öz fikrini nə iləsə əsaslandırır. Ona görə də hər kəsin bu bayramı öz fikirləri əhatəsində təqdim etməyə haqqı çatsa da, heç kimin bu bayramı özəlləşdirib öz fikirlərini zorla kiməsə qəbul etdirməyə haqqı yoxdur.

Novruz bayramından çox danışmaq olar, hətta cild-cild kitablar yazmaq olar. Bu bayram haqqında çoxlu məqalələr, kitablar yazılmışdır, hələ də yazılır və yazılacaqdır.

İslamşünas, tədqiqatçı, publisist, ondan artıq kitabın müəllifi, I qrup Qarabağ əlili Hacı Həsən Hüseyninin təqdim olunan bu kitabında da müəllifin həm öz fikirləri, həm də müraciət etdiyi müxtəlif müəlliflərin fikirləri ilə tanış oluruq. Burada Novruz həm bahar bayramı kimi təqdim edilir, həm də həmin günə təsadüf edən digər əlamətdar günlər haqqında məlumat verilir. Xıdır nəbi bayramına xüsusi yer verən müəllif onunla bağlı məqamlarıa da aydınlıq gətirir və bu haqda olan məqalələrdən sitat verir.

Novruz bayramını həm bahar bayramı kimi təqdim edib, çərşənbələrdən, bayram sovqatlarından, müxtəlif adətlərdən söz açan Hacı Həsən hətta bayramın təsvir olunduğu kinofilmlərdən də bəhs açmış, sənət əsərlərini bu aspektdən təhlilə çalışmışdır.

Novruz bayramının dini cəhətdən də əsaslandıran müəl-

lif, imamlarımızın (ə.m.) hədislərinə, bir çox dini alimlərin əsərlərinə də müraciət etmiş, bayramla bağlı fikirlərini maraqlı faktlarla əsaslandırmışdır.

Kitabda Novruz bayramı ilə bağlı namazın və digər dini əməllərin də təqdim edilməsi maraq doğurur.

Tədqiqatçı əsərdə yeri gəldikcə tanınmış şairlərin bayramı tərənnüm edən şeirlərindən sitatlar vermiş, bununla da ortaya bayram haqqında daha əhatəli, daha sanballı bir əsər qoymuşdur. Kitabda Şah İsmayıl Xətainin bahariyyəsi və onun nəsr formasını da təqdim edilmişdir ki, bu da təbiidir. Çünki, Azərbaycanın ən gözəl bayramı haqqında olan kitabda Azərbaycanın ən gözəl, ən layiqli hökmdarının adının çəkilməməsi insafsızlıq olardı.

Kitaba türk dilində sosial şəbəkədən götürülmüş ələvilərə aid bir məqalə də daxil edilmişdir ki, bu da Türkiyədəki qardaşlarımızın bizimlə eyni bayramı paylaşdıqlarını göstərir.

Kitabın sonunda müxtəlif şairlərin bayram şeirləri, xüsusilə Novruzu tərənnüm edən şeirlər, eyni zamanda yazın gəlməsini təsvir edən bahariyyələr də verilmişdir.

SONA XƏYAL

AMEA-nın Məhəmməd Füzuli adına
Əlyazmalar İnstitutunun böyük elmi işçisi,
Azərbaycan Yazıçılar Birliyinin
İrs komissiyasının sədri

# NOVRUZ XALQIMIZIN MILLI BAYRAMIDIR

Bismillahir -Rəhmanir -Rəhim!

Şərq ölkələrində üç cür bayram qeyd olunur: dini, məzhəbi və milli bayramlar. Mənsub olduğumuz müsəlman dinində 2 bayram mövcuddur. Qurban bayramı və Fitr bayramı. Qurban bayramı hicri qəməri təqvimi ilə Zilhiccə ayının 10-da, Qurban bayramı Şəvval ayının 1-də qeyd olunur. Məzhəbi bayramlar isə hər bir məzhəbin özünə məxsus olaraq qeyd olunur. Cəfəri məzhəbi üçün əsas bayramlar bunlardır: "Məbəs bayramı", "Mübahilə", "Qədir -Xum", "14 məsumun mövlud günləri" və s.

Milli bayramlardan birincisi Novruz bayramıdır. Bu bayram müsəlman ölkələrinin əksəriyyətində keçirilir. Hicri-qəməri təqvimi ilə Fərvərdin ayının 1-i, miladi tarixlə mart ayının 20-21-i yaz gecə-gündüz bərabərliyi günündə il təhvil olur və həmin gün Novruz adlanır. Novruz bayramı çərşənbələr də daxil olmaqla bir ay davam edir. Çərşənbələr ab-su, atəş-od, xak-torpaq, bad-yel ardıcıllığı ilə qeyd olunur.

Bizim bu kitabın yazılmasında əsas məqsəd Milli bayramımız olan "Novruz" və onun atributları barədə əziz oxucuları məlumatlandırmaqdır.

Bildiyimiz kimi, bir ildə 4 fəsil var: Yaz, Yay, Payız, Qış. Fəsillərin tacı olan yazın gəlişi Novruz bayramı ilə başlayır. "Novrüz" fars sözü olub, "nou - yeni", "ruz - gün" deməkdir. Xalq arasında bu bayram "Bahar bayramı", "Novruz bayramı" adı ilə məşhurdur. Bildiyimiz kimi Qış fəsli üç bölümdən ibarətdir: Böyük çillə 40 gün, kiçik çillə 20 gün, boz ay 30 gün çəkir. Çillələrlə bağlı xalq arasında maraqlı əhvalatlar danışılır. Onlardan ikisini qeyd

edirik: Böyük çillə qırx gün ömr edib gedər, yolda Kiçik çillə ilə qarşılaşar, kiçik çillə ondan nə etdiyini soruşar, deyər ki, qazanlar üstünə gəlmişəm, qarıları sağlam görmüşəm. Kiçik çillə deyər ki, eh, sən neyləmisən ki, mən gedib qazanları ağzı üstə çevirəcəyəm, qarıları təndirdən basıb küflədən çıxardacağam. Boz çillə də çıxıb deyər ki, sənin acığına mən də gedib əkinləri cücərdəcəyəm.

II variant

Böyük çillə kiçik çillə ilə rastlaşir. Kiçik çillə "getdin, nə qayırdın" deyə soruşur, böyük çillə deyir: "Təndirləri yandırdım, kürsüləri qurdurdum, küplərin, xaralların ağzını açdırdım. Kiçik çillə deyər ki, mən gedib küpləri, xaralları boşaldacağam, üzüqoylu qoyub gələcəyəm. Böyük çillə deyər ki, bacarmazsan, çünki ömrün azdır, qabağın yazdır.

Novruz bayramından öncə gələn dörd çərşənbə boz ayda olur. Belə ki, kiçik çillə qurtardıqdan dərhal sonra ilk çərşənbə olan su çərşənbəsi başlayır. Sonra od, torpaq, yel çərşənbələri qeyd olunur. Çox təəssüflər olsun ki, bu dörd çərşənbədən üçüncü və dördüncü çərşənbələrin yerləri dəyişik qeyd olunur. Amma biz klassik və aşıq ədəbiyyatında da görürük ki, çərşənbələri haqq aşiqləri və klassiklər bu arıcıllıqla qeyd edirlər. Ozan-aşıq sənətinin dərin bilicisi, könüllər sultanı, Azərbaycan Səfəvilər Dövlətinin banisi, Əhli-beyt (ə) aşiqi Ş.İ.Xətai və Haqq aşiqi Aşıq Qurbani də bu çərşənbələrin təsnifatını bu ardıcıllıqla vermişlər:

Aşiqisən gəl bəri kim, cani-canan məndədir,
Zahida, sən xandasan kim, nuri-iman məndədir.

Məndədir yer ilə göyün hikməti, həm qüdrəti,
Abu, ataş, xaku, badü cümlə ərkan məndədir.

***

Ay ağalar, dərdim yaman artıbdı,
Çərxi-fələk eldən daşım atıbdı.
Səkkiz şeydi, bu dünyanı tutubdu,
Abü atəş, xakü baddı, dördü nə?

Professor Kamil Vəliyev "Elimizdən, obamızdan" adlı kitabında yazır: "Yaz yetirdi özünü elimizə, obamıza. Bulaqlardan süd axar, ürəklər oyun-oyun oynar. Gömgöy xalıya bürünən yer-yurd dil açıb danışmaq istər, aşığa dönüb qubarlı ürəyin boşaltmaq dilər, ozana dönüb gələnlərdən, gedənlərdən, keçən yazdan ürəyində qalanlardan söz açmağa tələsər. qara gözlü gözəllərin, ər igidlərin ad-sanın göylərə qaldırmaq dilər.

Şərid-şərid olub yollara düzüləın gözəllər əllərində göycə-göycə səməni aparar, yeri-yurdu yaşıla beremək istər.

Sıra-sıra qızlar gedər...
Sıra-sıra nazlar gedər...
Sevinənlər gedər, sevinclər gedər...
Səməni,
Al məni.
Hər yazda
Sən yada
Sal məni.
Səməni, saxla məni,
İldə göyərdərəm səni.

Səməni sazana gəlmişəm,
Uzana-uzana gəlmişəm.

Səməninin səslədiyi göylük dirilikdir. Dizinin tabı gedən dağlar çiçəksiz, göysüz, göyərtisiz darıxar, heç bilməz neyləsin. Şırıl-şırıl suları daşmayan çaylar içli-içli burular, köpüklü-köpüklü axan ağca suları dörd gözlə gözlər. Dədə Abbasın sözləri yada düşər:

Duman, gəl get bu dağlardan,
Bahar gəldi, qar ələnməz.

Dədə Ələsgərin sözləri qanad alıb uçar. Qoç Koroğlunun ərlik-ərdəmlik dünyasından bir səs gələr:

Yaz olsun, ərisin dağların qarı,
Gözümə görünsün qardaşım dağlar.
Misri qılınc oynar al qan içində,
Düşər səndə qatı savaşım, dağlar".

Novruz bayramının tarixçəsi haqqında daha dolğun məlumat verən ilahiyyatçı alimlərimizdən biri  Natiq Rəhimovun "Təbiətin bayramı" adlanan məqaləsi də diqqəti çəkir. Novruz bayramını təbiət bayramı kimi təqdim edən müəllif bir sıra alimlərin dəyərli əsərlərinə müraciət edərək yazır: "Əbu Reyhan Biruni  "Əl-Asarül-baqiyə" və "Ət-Təfhim" kitablarında, Ömər Xəyyam "Novruznamə" risaləsində bu bayramdan ətraflı bəhs etmişlər. Klassik İslam alimləri Şeyx Tusi ("Müxtəsərül-Misbah"), İbn İdris ("Əs-Sərair"), Şeyx Bəhai ("Camei-Abbasi"), Əllamə Məclisi ("Zadül-məad" və "Biharül-ənvar"), Ayətullah Yəzdi ("Əl-Ürvətül-vüsqa"), Şeyx Abbas Qummi ("Məfa-

tihül-cinan”) və başqaları öz əsərlərində təqvim günlərinə məxsus şəriət əməllərindən bəhs edərkən, Novruzun ibadət və mərasimlərinə də geniş yer ayırmışlar. Dünya xalqlarına çoxdan məlumdur ki, Novruz (fars dilində “yeni gün” deməkdir) konkret astronomik hadisə ilə bağlı gündür. Bu gün şimal yarımkürəsində astronomik yaz girir, gecə-gündüz bərabərləşməsi baş verir. Astronomiya dili ilə desək, Günəş şərq zodiak sistemindəki Hut (balıq) bürcündən çıxıb, Həməl (qoç) bürcünə daxil olur.

Bəzi din və etiqad məktəbləri Novruzun cahanşümul mahiyyətini təsdiqləmiş, onu dini bayram səviyyəsində qəbul etmişlər. Novruz tarix etibarilə atəşpərəstlik (zərdüştilik) dinindən daha qədim olsa da, bu dinin daxilində özünün ən parlaq inkişaf dövrünü yaşamışdır. Zərdüştilər Novruzu öz əqidələrinə uyğunlaşdırmış, bir növ onu özününküləşdirmişlər. Məhz buna görə də həm keçmişdə, həm də indi bir çoxlarının zehnində Novruz atəşpərəstlərin bayramı kimi təsəvvür edilir. (Halbuki, bu fikir həqiqətə uyğun deyil və məqalənin növbəti bölümlərində bu barədə məlumat veriləcək). İslam mənbələrində göstərilmişdir ki, Novruz elə nadir milli bayramlar sırasına aiddir ki, İslam dini nəinki onu rədd etməmiş, əksinə, ona yeni ruh və təravət bağışlamışdır. Əlbəttə, Novruzun mənşəyini İslamla bağlamaq düzgün deyil. Novruz heç bir din və şəriətdən asılı olmayan təbiət bayramıdır. Dünyanın bir çox xalqları bu günü baharın gəlişi, təbiətin oyanışı kimi qeyd etmişlər. Maraqlıdır ki, ruslar xristianlığı qəbul etməzdən əvvəl yaz gecə-gündüz bərabərliyi günündən (yəni Novruzdan) bir həftə əvvəl və bir həftə sonra Maslenitsa bayramını keçirirdilər. Xristian kilsəsi sonralar bu bayramın vaxtını bir qədər irəliyə - Böyük Orucun (Velikiy Post) başlanğıcından əvvələ çəkdi. Yaz gecə-gündüz bərabərliyi bayramı

hətta Yaponiyada da dövlət səviyyəsində qeyd olunur. İslamın ilk dövrlərində yaşamış müqəddəslər Novruz gününü xoş sözlərlə yad etmişlər. Rəvayət edirlər ki, Həzrət Əli ibn Əbu Talibin (ə) xilafət illərində Ona Novruz hədiyyəsi gətirdilər (bu hədiyyənin farslara məxsus paludə (ərəbləşdirilmiş variantı faluzəc) adlı xörək olduğunu yazırlar). Əli (ə) bu hədiyyənin hansı münasibətlə verildiyini soruşanda, Novruz bayramı olduğunu söylədilər. İmam hədiyyəni qəbul edib buyurdu: "Hər gününüzü Novruz edin". Bu hədisin fərqli variantlarını Şeyx Səduq "Mən la yəhzürühül-fəqih" (III, 300), Beyhəqi "Əs-Sünənül-kübra" (IX, 392), Səmani "Əl-Ənsab" (III, 37) kitablarında qeyd etmişlər. Bəzi məlumatlara görə, Həzrəti-Əliyə (ə) hədiyyə gətirən adam əslən fars mənşəli olan Hənəfi məzhəbinin banisi Əbu Hənifənin babası Nöman ibn Mərziban imiş...".

Əgər mövzu Novruz bayramıdırsa, şimallı-cənublu Azərbaycanın əzizi, mərhum şairimiz Məmmədhüseyn Şəhriyarın "Heydərbabaya salam" poemasındakı Novruz bayramına və axır çərşənbə olan yel çərşənbəsinin tərifinə həsr olunmuş məşhur bir parçanı - o şirin bayram tərifini qeyd etməmək günah olardı:

Heydərbaba ildırımlar çaxanda,
Sellər-sular şaqqıldayıb axanda,
Qızlar ona səf bağlayıb baxanda,
Salam olsun şövkətizə, elizə,
Mənim də bir adım gəlsin dilizə.

Heydərbaba kəhliklərin uçanda,
Kol dibindən dovşan qalxıb qaçanda,
Baxçaların çiçəklənib açanda,

Bizdən də bir mümkün olsa yad elə,
Açılmayan ürəkləri şad elə.

Bayram yeli çardaxları yıxanda,
Novruzgülü, qarçiçəyi çıxanda,
Ağ buludlar köynəklərin sıxanda,
Bizdən də bir yad eyləyən sağ olsun,
Dərdlərimiz qoy dikkəlsin dağ olsun.

Bayram idi   gecə quşu oxurdu,
Adaxlı qız bəy corabın toxurdu.
Hər kəs şalın bir bacadan soxurdu,
Ay nə gözəl qaydadı şal sallamaq,
Bəy şalına bayramlığın bağlamaq.

Şal istədim mən də, evdə ağladım,
Bir şal alıb tez belimə bağladım,
Qulamgilə qaşdım, şalı salladım,
Fatma xala mənə corab bağladı,
Xan nənəmi yada salıb ağladı.

Heydərbaba, Mirzəmmədin bağçası,
Bağçaların turşaşirin alçası,
Gəlinlərin düzməçəsi, taxçası,
Hey düzülür gözlərimin rəfində,
Xeymə vurar xatirələr səfində

Bayram olub qızıl palçıq əzərlər,
Naxış vurub otaqları bəzərlər,
Taxçaları, düzmələri düzərlər,
Qız-gəlinin fındıqçası, hənası,
Həvəslənər anası, qaynanası.

Bakıçının sözü-sovu, kağızı,
İnəklərin bulaması, ağızı,
Çərşənbənin girdəganı, mövizi,
Qızlar deyər: “Atıl-matıl, çərşənbə,
Ayna təkin bəxtim açıl, çərşənbə”.

Yumurtanı göyçək güllü boyardıq,
Çaqqışdırıb sınanları soyardıq,
Oynamaqdan bircə məgər doyardıq?
Əli mənə yaşıl aşıq verərdi,
İrza mənə novruzgulu dərərdi.

Novruzəli xərməndə vəl sürərdi,
Gahdan yenib küləşləri kürərdi.
Dağdan da bir çoban iti hürərdi,
Onda gördün ulaq ayaq saxladı,
Dağa baxıb qulaqların şaxladı.

“Novruz” əsrlər boyu dünyanın bütün bayramlarından fərqli olmuşdur. “Novruz” ictimai bir qərar və qəbul etdirilmiş siyasi bir münasibət olmadığına görə həmişəyaşardır. Bu bayram ümumbəşəri bir şənlik, yer ilə göyün şadlıq günüdür. Hissləri coşduran, çiçəklənmələrin həyəcanıdır. Novruz bayramı adət-ənənəsi xalqların gözəl adətlərindəndir. Yaz fəsli ilk mövsüm, novruz isə ilk gündür. Məşhur alimlərdən biri yazır: “Novruz haqqında yeni bir söz söyləmək çox çətindir. Novruz milli bayramdır”.

# NOVRUZ BAYRAMININ MEYDANA GƏLMƏSİ

Azərbaycan ədəbiyyatının günəşi, dahi şairimiz Nizami Gəncəvinin "Xəmsə"sində bahar fəslinin təsviri öz parlaq əksini tapmışdır.

Baharın var bu gün, ye meyvəsindən
Hər gün Novruz olmaz məgər bilmirsən?

Bu bayramın necə yaranmasına dair müxtəlif tarixi rəvayətlər və yazılar vardır. Onların ən üstünü və önəmlisi Novruzun yaranmasını "Pişdadi" sülaləsinə mənsub edir.

"Novruz" bayramı haqqında Firdovsi "Şahnamə"də, Ömər Xəyyam "Novruznamə"də, Əbureyhan Biruni və Təbəri öz əsərlərində söz açmışlar. Məsudi yazır: "Xalqın çoxu Novruzun o dönəmdən başlanmasına və şahların rəsmi bayramları olduğuna inanmaqdadırlar".

Nuhun (ə) müasiri olan, 716 il davam edən Pişdadi sülaləsinin şahlarından biri Xurşid oğlu Cəmşiddir. O, 384-cü ildə Zöhhakı məğlub edəndən sonra şahlıq taxtına çıxdı. Novruz "parsi"lər ilinin ilk günü olaraq onlardan yadigar qalmışdır. Cəmşid səltənətinin 316-cı ilində Azərbaycanı fəth etdi. Orada onun üçün şərqə tərəf şanlı bir taxt qurdular. Şah taxta əyləşib, daş-qaşla bəzənmiş tacını başına taxan zaman gün çıxdı və şahın cəvahirləri parıldadı. Xalq şadlıq edib dedi: "Bu gün yeni gündür". Cəmşid şah əmr etdi ki, İran xalqı hər il o günü bayram etsinlər.

Dahi Nizami Gəncəvi də "İskəndərnamə" poemasında Zöhhakı Cəmşidin taxtdan saldığını qeyd edərək insanları ədalətli olmağa səsləyir:

Qocaman ağaca mişar çəkmə sən,
Zöhhak bunun üçün düşdü təxtindən.

"Qocaman ağac" sözlərində məqsəd bunu çatdırmaqdır ki, Pişdadi sülaləsinin 4-cü şahı ədalətsiz olduğu üçün Cəmşid şah onu taxtdan salmış, özü isə taxt-tac sahibi olmuşdur.

Şərqin dahi şairlərindən Firdovsi "Şahnamə" əsərində Cəmşid şah və Novruz barəsində belə deyir: "Bu mübarək Novruz günü o zamandan yadigar qalmışdır".

Ömər Xəyyam Nişapuri "Novruznamə"də yazır: "Kiyumərs 3197 (e.ə) ildə İranın ilk padşahı olaraq şahlıq taxtına keçdi. O illər və aylara ad qoymaq və tarix yazmaq istədi. Kiyumərs o günün səhəri vaxtı, həməl bürcü ilk dəqiqəsinə gələndə bütün əcəm bilicilərini toplayıb əmr etdi ki, tarixi buradan başlasınlar. Habelə ilin 4 mövsümünü yəni, yaz, yay, payız, qış mövsümlərini də Kiyumərs təyin etdi. Amma bu günü "Novruz" adlandıran Cəmşid idi. Cəmşid bu günü bayram qərar verib, şadlıq qurmağı əmr etdi".

İranın məşhur şairi Ünsüri deyir: "Böyük Novruz gəldi; Dünyanın zinəti İranlılar üçün Cəmdən (Cəmşiddən) miras qalmışdır".

Öz rübailəri ilə dünyaya səs salan və incə qəlbli insanların böyük rəğbət və hörmətini qazanan şair, şərq filosofu Ömər Xəyyam Nişapuri də bir "rübai"sində 4 ünsürdən söz açmışdır.

Ey dördlə yeddinin məhsulu insan,
Bu dördlə yeddidə nə qovrulursan.
Mey iç ki, min dəfə demişəm sənə,
Bir kərə getdinmi, dönməzsən inan.

Şair bu rübaisində dörd ünsürü - su, od, torpaq, yel və yeddi planeti göstərir. Şair insanlara çatdırır ki, sənin yaradılış xəmirin bu 4 ünsürdən təşkil olunub və bu müvəqqəti dünyada da 4 ünsürdən istifadə edirsən, bəs niyə şükür etmirsən?

"Mey iç" deməklə şair əbcəd hesabı ilə "mey"in 14 demək olduğunu bildirir. "Mim" 10, "yey" - 4, Mey-14. 14-dən də məqsəd 14 məsumdur:

Peyğəmbər(s), Həzrəti-Fatimeyi-Zəhra (s.ə) və 12 İmam. Əgər Yer üzündə yaşayan insanlar bu 14 məsuma məhəbbət göstərməsələr, axirətdə peşman olacaqlar və deyəcəklər ki, kaş bir də dünyaya qayıdıb, onların məhəbbəti ilə yaşayaydıq. Şair yazır ki, ey insan, təfəkkür et, düz yolu tut. Mövlanə Cəlalləddin Rumi demişkən:

Əgər varsa ağlınız, təyin edin düz yolu,
Ondan sonra şövq ilə gediniz dümdüz yolu.

Çəkisinə, vüsət və kütləviliyinə görə, qədimliyi və adət-ənənə zənginliyinə görə, onunla müqayisə olunacaq ikinci belə bayram yoxdur. Novruzun adət və ənənələri xalqımızın saf niyyətinin, humanist xarakterinin və yüksək əxlaqi mənəvi keyfiyyətlərinin təcəssümüdür. Hər ilin yaz gecə-gündüzü bərabərliyində, varlığın oyanış dönəmində ərgənləşən Novruz həm də, qoca türkün eli və özü qədər qədim və uludur. Ulu ən əvvəl Uca Tanrımıza deyirik. Ulu vətənə, yurda deyirik. Ana təbiətə ulu deyirik. Yeddi arxa dönənimizdən o üzdəki dədə-babalarımıza ulu deyirik. Ulululuq – müqəddəslikdir, ülviyyətdir. Novruz- milli olduğu kimi həm də, ulu bayramımızdır. Səmavi kitabların ən dolğunu, qüsursuzu və insan üçün ən faydalısı olan

"Qurani-Kərim" Allah kəlamı, Allah buyruğudur. Novruz adətlərini diqqətlə araşdırsaq görərik ki, "Qurani-Kərim"də təsbit olunan əxlaqi-bəşəri keyfiyyətlər bu adətlərimizdə ehtiva olunmuşdur. Novruzda təbiətə, vətənə, insana sevgi var. Şərə qarşı mübarizə və xeyirin təntənəsi var. Milli birliyə, barışığa və əqidə bütövlüyünə çağırış var, əbədiyaşarlıq var

İmam Cəfəri-Sadiq (ə) Novruz bayramı günü il təhvil olanda bu duanı oxumaq tövsiyə etmişdir:

"Bismillahir Rəhmanir Rəhim!
Ya müqəllibəl qülubi vəl əbsar,
Ya müdəbbirəl leyli vən nəhar.
Ya mühəvviləl hövli vəl əhval,
Həvvil haləna ilə əhsənil hal.

Tərcüməsi:
Bağışlayan və Mehriban Allahın adı ilə!
Ey qəlbləri və gözləri dolandıran Allah!
Ey gecə və gündüzün tədbirini tökən Allah!
Ey halları (işləri) və illəri dəyişdirən Allah!
Dəyişdir halımızı ən gözəl hala Allah!"

# XIDIR NƏBİ BAYRAMI

Ta qədimdən xalqımız arasında Novruz bayramı qədər sevilən Xıdır-Nəbi günləri də qeyd olunduğundan, bu kitabda Novruz bayramından danışmaq üçün ondan əvvəl keçirilən Xıdır nəbi bayramı haqqında da söz açmağı və Xızırın kimliyi və ona həsr olunmuş mərasimin hansı günlərə təsadüf etdiyi haqda da məlumat verməyi özümüzə borc bilirik. Əvvəlcə görək Xıdır nəbi, yəni Xızır peyğəmbər kimdir və Xıdır nəbi bayramı necə və nəyə əsasən yaranmışdır. Görkəmli Azərbaycan hökmdarı, gözəl şeirləri ilə ədəbiyyat tariximizdə şair kimi özünəməxsus yeri olan Şah İsmayıl Xətai yazır:

Min bir adı vardır biri də Xızır,
Harada çağırsan orada hazır.
Əli padişahdır, Məhəmməd vəzir,
Bu fərmanı verən Əli deyilmi?!

Bildiyimiz kimi Qurani-Kərimin «Kəhf» (Mağara sahibləri) surəsində Xızır peyğəmbərin batini elmlərə, Musa peyğəmbərin isə zahiri elmlərə malik olduğu bildirilir. Ürfan alimləri də Musanın (ə) zahiri elmi, Xızrın (ə) batini elmlərə malik olduğunu bildiriblər. Onlar deyirlər ki, Həzrəti-Musaya (ə) əmr olundu ki, Xızırdan (ə) batini elmləri öyrənsin. Ariflər Həzrəti-Xızıra (ə) böyük əhəmiyyətlə yanaşırlar. Onlar öz ürfani şeirlərində Xızırın adını çox çəkmiş, onu eşq cilvəsi, «Piri-təriqət» və əbədi həyata malik insan olduğunu qələmə almışlar.

Ürfan şairlərindən olan Xaqani Şirvani qəzəllərindən birində yazır:

Rəye-rəxşane-to bər çeşmeyi-Xizr
Rəfte bizəhməte - rahi - zəlamat.

(Sənin parlaq fikrin Xızrın çeşməsinə doğru heç bir əziyyət çəkmədən zülmət yolunu getmişdir).

Musanın (ə) elm öyrəndiyi alimin kim olduğu haqda da müxtəlif nəzəriyyələr vardır. Çünki, Quranda həmin alimin adı çəkilməmişdir. Bu barədə də çoxlu sözlər deyilmişdir. Lakin o alimin Xızır (ə) olduğu daha çox alimlər arasında məşhurdur. Bundan əlavə Xızırın (ə) öz barəsində də müxtəif nəzəriyyələr vardır. Şeyx Səduqun İmam Sadiqdən (ə) rəvayət etdiyi hədisə əsasən, "Xızır mürsəl peyğəmbərlərdən idi. Allah-təala onu öz qövmünə peyğəmbər göndərdi. O da camaatı Allahın təkliyinə, peyğəmbərlərin və onlara nazil olmuş kitabların haqlı olduğuna dəvət etdi. Həzrəti-Xızırın (ə) möcüzələrindən biri bu idi ki, qurumuş ağaca söykənsəydi yarpaqlayardı, ya ot bitməyən yerdə otursaydı durandan sonra ora yaşıllaşardı. Elə buna görə də ona «Xızır» (ə) ləqəbini vermişdilər. Onun əsl adı Taliyadır. O, Mələkan ibn Abir ibn Ərfəxşəd ibn Sam ibn Nuhun oğludur".

Bəzi rəvayətlərə əsasən, o, İskəndərin qoşununun başçısı idi. O, əbədi həyat suyunu tapıb içdi, ona görə də uzun ömür sahibi olaraq indiyə qədər yaşayır. XII əsr Azərbaycan ədəbiyyatının iki qanadından biri olan dəyərli şairimiz Əfzələddin Xaqani Şirvani yazır:

Zəhre-səfər nuş kon əvvəl ço Xizr,
Pəs berəvo çeşmeyi-heyvan tələb!

(Xızr (ə) kimi öncə səfər zəhərini iç, sonra gedib dirilik suyu axtar).

Bir hədisdə İma Rza (ə) buyurur: «Xızır (ə) həyat suyu içdi və Sur (Qiyamətdə səslənən şeypur) səslənənə qədər sağ qalacaq. Şiə mühəddisləri nəql edirlər ki, Məhəmməd (s) dünyadan gedəndən sonra Xızır (ə) başsağlığı vermək üçün naməlum bir şəxs kimi, Həzrətin (s) evinə gəldi. Hələ Məhəmməd Peyğəmbər (s) sağ ikən Xızır (ə) dəfələrlə Həzrətin (s) və Əlinin (ə) yanına gəlib onlardan bəzi sualları soruşmuşdur. Həmçinin Əli (ə) də şəhid olanda Xızır (ə) Kufəyə gəlib bir neçə söz demişdir. O, başqa imamların yanına da gedirdi. Xızır 12-ci imamın qeybə çəkildiyi dövrdə də o Həzrətin yanına gedir və imamla söhbət edərək onu tək qalmağa qoymur. O hər il Həcc mərasimində iştirak edir. Nəql olunduğu kimi, müxtəlif yerlərdə adi adamlar da Xızırı (ə) görüb və onun söhbətlərini hədislərində danışmışlar. Əgər hər kəs bu hədisləri yığsa bir kitab yaza bilər. Mühəddis Qumi adi adamarın Xızırı (ə) görüb ondan nəql etdikləri hədislərin mündəricatını "Səfinətül-bihar" kitabında vermişdir. (Seyyid Haşim Rəsuli-Məhəllati. «Peyğəmbərlərin həyatı». «Əndişeye -Hadi» nəşr: 2010, səh. 326-327).

Bildiyimizə görə, Xızır nəbi mərasimləri əsasən kiçik çillənin son dörd günü və boz ayın əvvəlinci dörd gününə təsadüf etməklə, cəmi 8 gündən ibarətdir. Bu bayram fevralın 17-dən başlayaraq 24-də bitir.

İranda da müsəmanlar uzun illər «Xızır nəbi» bayramını keçirmişlər. Onu gah Xızır nəbi, gah da Xıdır nəbi kimi anırlar. Bayram kiçik Çilləyə təsadüf edir. Xızır nəbi günlərinə hətta mahnı da qoşmuşdur:

Xızır Nəbinin soyuğu,
Təndirə təpər toyuğu.

Əvvəllər bayram bir həftə, yaxud 10 gün ərzində keçirilərmiş. Bayram qış mövsümündə keçirilirdi. Hazırda çox yerdə unudulsa da, bəzi ailələrdə yenə də qeyd edilir. Bu bayram haqqında yaddaşlarda qalan məlumatları da topladıq. Xıdır nəbi bir çox türkdilli xalqların bayramı hesab olunur. Xızır nəbi günlərini dini bayram deyil, etimoloji bayram hesab edirlər. Bu, Ruzi-Xızır, Xızır İlyas günləri kimi də tanınır. Həmin gün Xızır peyğəmbərlə İlyas peyğəmbərin görüşdüyünü deyirlər və guya həmin günləri bayram edirlər. Bayramın Fevralın ikinci ongünlüyünə təsadüf etdiyini qeyd edirlər. Burada İlyas torpağı, Xızır suyu təmsil edir. Onların görüşü yazın gəlişini təmin edir. Odur ki, məhz Xızır və İlyas, yəni- Xızır İlyas günləri adlandırılır.

Böyük Çillə ilə Kiçik Çillə arasında keçirildiyi də deyilir. Şifahi ədəbiyyat isə təsdiq edir ki, bayram Kiçik Çillənin əvvəlinə təsadüf edir.

Masallı folkloruna görə də, "böyük çillə ilə kiçik çillə arasında Xıdır bayramı olur. Deyilənə görə, Xıdır dörd gün böyük çillədən, üç gün kişik çillədən götürür. Kişik çillə çaxmaq olur, kiçik çillə müsibət olur. Ona görə deyir, ömrüm az, qabağım yaz. Sonra var oğrubığ, doğrubığ. Oğrubığdan sonda doğrubığ gəlir".

Azərbaycan klassik aşıq ədəbiyyatında da bu günlərin izlərinə təsadüf etmək olur. Misal olaraq Aşıq Bəhmən Göyçəlinin «Ya Əli» rədifli divanisinin bir bəndinə nəzər yetirək:

Gəlməmiş dünya üzünə, Salmanı aldın şirdən,
Tifl ikən mərcə girdin, pünhan oldun Xızırdan.
Gəzəndə çeşmə başında sən zahir oldun birdən,
Xəbər aldı İlyas səndən, gəldin hardan, ya Əli?

Düzdür bu bənddə Həzrəti-Əlinin (ə) Peyğəmbər səhabəsi Salmanı, Xızır və İlyas peyğəmbərləri imtahan etməsindən söhbət gedir. Ancaq bənddə Xızır və İlyas peyğəmbərlərin adı çəkildiyindən onu xatırlatmağı məqsədə uyğun bildik.

AMEA Folklor İnstitutunun böyük elmi işçisi, filologiya üzrə fəlsəfə doktoru Əpoş Vəliyevin "Xıdır nəbi" bayramının tarixi haradan başlayır?" sərlövhəli məqaləsində yazır: "Xalqımızın qədim tarixə malik olan və el arasında geniş yayılmış mərasimlərindən biri də Xıdır Nəbi (Xıdır İlyas) adlanan mərasimdir. Hər il fevral ayının 9-u, 10-u, bəzi kəndlərdə isə 14-ü, 15-i (Xızır İlyasın doğulduğu gün) Xıdır Nəbi bayramı xüsusi adət-ənənələr və təntənəli şəkildə qeyd edilir. Mərasim həm də fevralın 1-dən 20-sinə kimi olan kiçik çilləyə təsadüf edir. Tədqiqatlarda Xıdır Nəbi bir şəxsiyyət olaraq "su, külək və havanın himayəçisi" kimi təqdim olunur. Ümumiyyətlə, bu mifik obrazla bağlı mübahisəli məsələlər çoxdur. Onun adının Xızır, Xızır İlyas, Xıdır Nəbi, Xıdır baba və Xıdır Zində olması haqda fikirlər müxtəlifdir. Kiçik çillənin çıxması münasibətilə keçirilən "Xıdır Nəbi" bayramı əsasən Naxçıvan, Tovuz, Qazax və s. bölgələrdə müxtəlif adlarla (Xıdır İlyas, Xıdır Zində) keçirilir".

Müəllif məqaləsində bəzi rəvayətləri təqdim etmiş, Xızır peyğəmbərin bir qabda dirilik suyu götürüb insanlara gətirdiyini, yorulub yolda bir çinarın kölgəsində yatdığını, birdən qabın aşıb, suyun çinarın dibindəki çuxura töküldüyünü, suyun bir hissəsinin qarğalar tərəfindən içildiyini və buna görə də insanlarda "qarğalar üç yüz il yaşayırlar, çinar ağacı da uzunömürlüdür" düşüncəsinin yarandığını diqqətə çatdırır. Başqa bir rəvayətdə isə qaranlıq

dünyada bir bulaq axdığını, onun suyunu içən şəxsin heç vaxt ölmədiyini, Xızırın da o dirilik suyundan içdiyi üçün həmişə diri olduğunu bildirir.

Müəllif həmçinin türk şairi Üsulinin, görkəmli təfsir alimi Təbərinin, tədqiqatçı Qordlevskinin fikirlərinə, "Kitabi-Dədə Qorqud" dastanına da müraciət edərək, öz fikirlərini təsdiqləyir.

Hələ qədim zamanlardan insanlar Xızır peyğəmbərin darda qalanlara, çətinliyə düşənlərə kömək etdiyinə inanmışlar. Buna görə də müxtəlif xalqlar, xüsusən də türkdilli xalqlar qışda Xızır peyğəmbərin şərəfinə Xıdır nəbi mərasimini təşkil edərək, onu köməyə çağırmışlar. Azərbaycanda da çərşənbələrdən əvvəl Xıdır nəbi bayramına hazırlıq görülür. Əvvəlcədən həyət-baca, ev eşik təmizlənir. Bayram yemişləri hazırlanır. Xonçalar tutulur, şirniyyatlar bişirilir. Evin hündür bir yerinə xonça qoyulur. Guya gecə Xızır peyğəmbər gəlib, ona əl basır. Evlərdə Xıdır nəbinin şərəfinə çıraqlar, ya şam yandırılır. Xalqda bu adət belə ifadə edilir:

Xızır, Xızır, xız gətir,
Var, dərədən od gətir.
Xızıra Xızır deyərlər,
Xızıra çıraq qoyarlar.

Bakıdan Dəvəçiyə gedən yolun sonunda "Xıdır Zində" dağı var, yəni diri, yaşayan Xızır peyğəmbərin ziyarətgahı. Bu dağın zirvəsində Xızır peyğəmbər namaz qılmış sonra qeyb olmuşdur. Xalq arasında bu dağa "Beşbarmaq" ziyarətgahı da deyilir. Görünür bu da Pənctəni Ali Əbaya işarədir.

Xız istilik deməkdir. Xızırın gəlməsi ilə yazın gəlməsi,

torpağın qızması baş verir. Xalq arasında Xızır peyğəmbərlə bağlı müxtəlif mahnılar qoşulmuşdur.

Xıdır Nəbi, Xıdır Ilyas
Bitdi çiçək, oldu yaz!

Xıdır nəbi bayramının öz ayinləri vardır. Evin ağsaqqalı bıçağı götürüb tövləyə girər, bala verməyən heyvanın yanında dayanıb "evdə yağımız, ətimiz, yavanlığımız qurtarır, bu da bala vermədiyi üçün mən bunu kəsirəm" deyər, evin ağbirçəyi də gəlib "kəsmə, bundan sonra hər il bala verəcək, əgər verməsə sonra kəsərsən" deyər. Eləcə də yumurtlamayan toyuqları bir yerə yığır, bir oğlan uşağı bıçağı götürüb "ətimiz, yumurtamız bitib, toyuqlar da yumurtlamır, hamısını kəsirəm" deyər, evdən bir nəfər çıxıb "kəsmə, mən onlara Xıdır nəbi qovurğası verərəm, onlar da yumurtlayar" deyər və toyuqlar yumurtlamağa başlayarlar. Xıdır nəbi ayinlərindən "Ağacqorxutma" maraq doğurur. Ağac bar vermədikdə, "çilləyə düşüb" deyərlər və evin kişisi baltanı götürüb kötüyünə asta zərbə vura-vura deyər ki, "havalar çox soyuq, yanacağımız da tükənib, bu ağac da bar vermədi, onu kəsib yandıraq. Evdən  biri çıxıb onu tutar və deyər ki, kəsmə, bu il bar verəcək. Bu  "baltakəsmə", "bıçaqkəsmə", "qorxutma" və s. ayinlər illər uzunu insanların inancında özünə möhkəm yer tutmuşdur.

25 fevral 2000-ci il tarixdə  Xəzər rayonunun Buzovna qəsəbəsində  Qafqaz Müsəlmanları Ruhani İdarəsinin Qazısı, "Məşhədi Qərib" məscidinin axundu Hacı Soltan Hüseynqulu oğlu Əlizadə  ilk dəfə olaraq geniş şəkildə "Xızır nəbi" bayramını qeyd etdi. Həmin bayram tədbirinə müxtəlif təbəqədən olan insanlar dəvət olunmuşdu.

Məclisin təşkilatçısı və aparıcısı axund Hacı Soltan nitqində bildirdi ki, Azərbaycanın ən qədim bayramlarından biri “Xızır nəbi” bayramıdır. Xızır nəbi 124 min peyğəmbərimizdən biridir. 4 peyğəmbərimiz diridir. İsa (ə), İdris (ə), Xızır (ə) , (İlyas). Hz.Xızır abi-həyat (dirilik suyu) çeşməsindən su içmiş və əbədi diri qalmışdır. Xızır sözü Xəzra-yəni yaşıl mənasını verir. Çünki o peyğəmbər hara qədəm bassa o yerlər göyərər, yaşıl dona girərmiş. Elə bu bayramın vaxtı da xalqın qışdan, qar və çovğundan, çillədən çıxıb yaza qovuşmaq eşqi ilədir. “Xızır nəbi” bayramı Novruz bayramının əkiz qardaşıdır və Novruzun başlanğıcıdır. “Xızır Nəbi” bayramından sonra dərhal çərşənbələr başlayır.

Novruza hazırlıq görülür. Xızır Nəbi bayramı Fevral ayının 20-dən ta Novruza qədər olan günlərdə qeyd olunur. Əsasən Fevralın 25-dən 28-nə qədər. Həmin günlərə “Xızır günləri” deyilir. Xızır peyğəmbər yaşıllıq gətirir və novruzun müjdəsini verir. Rəvayətlərdə nəql olub ki, Xızır peyğəmbər Hüccətin (ə) zühur müjdəsini də verəcək. İnşəallah.

Türkiyə xalqı da bu bayramı yüksək səviyyədə qeyd edirlər. Türkiyədə “Xızır Nəbi” bayramı əsasən 3 gün qeyd olunur. Onlar bu bayramı may ayında qeyd edirlər. Təxminən may ayının 6-dan 8-nə qədər.

Bayramın üçüncü günü cütcü və əkinçinin şəxsində torpağı becərən, şum şumlayan, əkin əkən əməkçilər tərif olunardı. Boz at üzərində gələcək Xıdır Nəbinin əlində od olacağı güman edilərdi. Onun torpağı isidən, odla yanaşı günəş və su, adamlara sağlamlıq gətirəcəyi düşünülərdi. Mərasimdə əkinçi, cütçü və sayaçı nəğmələri oxunar, "Xıdır Nəbi"yə nəğmələr, şerlər qoşulardı. Bayramın hər üç günündə cavanlar əkin yerlərindən keçib Xıdır Nəbini

axtarmağa gedərdi. Onlara "Xıdırçı" deyərmişlər. Xıdırçılar hava işıqlanmazdan əvvəl əllərində şam Xızırın dalınca gedər və nəğmələr oxuyardılar. Bu bayram demək olar ki, bütün türk xalqlarında keçirilir. Daha çox Xıdırelləz, Hıdırelləz bayramı adı ilə tanınır. Hıdırelləz böyük çoxluqla Anadolu və Balkan türkləri arasında qeyd edilməkdədir. Qədimdən Ruzi-Hızır (Xızır günü), yəni Xıdırelləz xalq arasındakı inama görə Xızırla Ilyasın bir araya gəlməsi xatirinə keçirilir. Bu bayram yeni təqvimə görə hər il 6 mayda qeyd olunur. Julyen təqviminə görə isə 23 aprelə düşür. Türkiyədə qədim təqvimə görə il ikiyə bölünür. 23 apreldən (6 may) 28 Oktyabra (8 Noyabr) qədər 186 gün Hızır günləri adıyla yaz mərasimi, bu tarixdən təkrar 23 Aprelə (6 may) qədər davam edən 179 gün də Noyabr günləri adıyla qış mövsümü meydana girir. Başqa bir fikrə görə Xızır Nəbi bayramı iranlıların Novruzundan beş həftə əvvəl, yəni Şubat ayının ortalarına təsadüf edir. Bunun qədim on iki heyvanlı Türk Təqvimindəki ilbaşı ilə eyni olduğunu, dolayısı ilə bu bayramın əslində qədim türklərin yeni il bayramı hesab edildiyini göstərən mənbələr var.

Bu bayram Azərbaycanda Xızır Nəbi bayramı, İranda Əhli-haqq zümrələri arasında Zati-Mutlaq (Ali) şərəfinə Əli-Heydər adıyla, Təbriz ətrafındakı Qızılbaşlar zümrəsində isə yenə də Xızır Nəbi bayramı adı ilə tanınır.

Yuxarıda deyilənlərdən də göründüyü kimi, həmin bayramın keçirilməsi, qeyd olunma tarixi səbəblərində müxtəliflik olsa da, nəticədə keçirilən mərasimlər, icra olunan adətlər birləşir. Xızır Nəbi bayramının nə vaxtdan bəri keçirildiyi tam məlum olmasa da onun türk xalqları arasında geniş yayıldığına şübhə yoxdur. Xalqın Xızır peyğəmbərə olan inamı o həddə çatmışdır ki, bu ad insan-

ların and yerinə çevrilmişdir. "Xızır İlyas haqqı", "Xızıra and olsun", "Xıdır Zində babaya and olsun" və bu səpkili digər andlar xalqın məhəbbət və inamından doğmuşdur. Bəzi alqışlar da məhz Xızır peyğəmbərin adı ilə bağlıdır. Məsələn, "Xıdırın diləyi üstündə olsun", "Xıdır nəbi köməyin olsun", "Xıdır nəbi hayına yetsin", "Xıdır nəbi kömək əlini üstündən əskik eləməsin", "Xızır köməyinə yetsin", "Xızır səni dardan qurtarsın", "Xızır səni yolda qoymasın", "Xızıra rast gələsən", "Xızır payını versin", "Xıdır-zində diləyini qəbul etsin", "Xıdır-zində diləyini xeyirə yazsın", "Xıdır-zindəyə apardığın qurban sənin arzunu versin"

Azərbaycan folklorunda Xızırla bağlı inamlar da sayca üstünlük təşkil edir. Eyni zamanda həmin inamları çoxşaxəli də adlandırmaq olar. Məsələn, "Tut ağacını qurumamış kəsmək günahdır". Deyilənə görə, bu ağacı Xızır peyğəmbər ehsanlıq üçün əkib. Yaxud "Xızır gecəsi" peyğəmbər hansı qapıdan öz buğda payını aparарsa, həmin il o evin ruzisi artar, bərəkəti çox olar.

O vaxt ki, Kərbəladə Hürr (ə) tövbə edib İmam Hüseynin (ə) tərəfinə keçdi və İmama dedi ki mən Mədinədən çıxanda qulağıma səs gəlirdi ki "Bəşarət olsun sənə ey Hürr. Sən çox xoşbəxt adamsan". Fikirləşirdim ki, mən peyğəmbər balasının davasına gedirəm, necə xoşbəxt bir adam ola bilərəm? İmam Hüseyn (ə) Hürrdən xəbər aldı ki sən bilirdin o səs kimin səsi idi? Hürr (ə) dedi: Xeyr. İmam buyurdu: Ya Hürr, o Xızır peyğəmbərin səsi idi, bugünkü gününə görə sənə müjdə verirdi. Yadımızda saxlamalıyıq ki, Xızır peyğəmbər (ə) baharın müjdəçisidir. Bunu da bilməliyik ki, o həm də 12-ci imamın zühurunun müjdəçisi olacaqdır.

Azərbaycan toponimikasında Xızır nəbi ilə bağlı toponimik və etnoloji adlar, rəvayət və əfsanələr mövcuddur. Hamı Xıdır-Zində pirinin olduğundan xəbərdardır və bu pirin bəzi möcüzəvi təsirlərindən də danışılır. Bəzən adlarda, bəzən toponimikada olmuş hadisələr və müqəddəsatın varlığı, cəmiyyətdə ona münasibət haqda canlı yadigarlar var.

Xüsusilə, şifahi ədəbiyyatda rəvayət və əfsanələrdə bunları daha dərindən izləmək olar. Bu tip rəvayətlərdən biri də Xıdır-Zindəyə aiddir. Rəvayət olunur ki, Allah qatında Ata haqqı böyükdür. Valideynin məhəbbətini qazanmaq çox önəmlidir. Çünki, ata bədduasının qəbul olunduğu barədə ciddi xəbərdarlıq vardır. Xıdır-Zindənin də bu baxımdan tərbiyəvi, dini-mistik mənası vardır: Nəql olunur ki, Xızırın iki oğlu varmış, hələ uşaq yaşlarında olan bu oğlanları sübh tezdən dənizə (Xəzərə) göndərən ata onlara tapşırır ki, su gətirsinlər, dəstəmaz alacam. Uşaqlar dənizə gedir və orada başları qarışır, gün doğana qədər oynayırlar. Günəşi görən uşaqlar birdən xatırlayır ki, onlar atalarına dəstəmaz suyunu çatdırmaq üçün gəlmişdilər. Elə bu vaxt onlara yaxınlaşan Xıdır-Zində əsəbiləşib uşaqlara bəddua edir: «Sizi daşa dönəsiz, gün çıxdı, mənim namazım qəzaya gedir axı». Uşaqlar daşa dönür. Rəvayət edirlər ki, həmin daşlar dənizdə əvvəllər görünürmüş. Zamanla su qalxdıqca onlar suyun atında qalmışdır…

Hədislər xəbərdarlıq edir: Ata qarğışından çəkinin. Onların həm duası, həm qarğışı Allah dərgahında qəbul olunur. Atanın duası zəmiyə verilmiş su misallıdır ki, yaşıllanıb boy atar.

Yunis İmrənin məşhur bir şeirində xatırlanır:

Sənə derəm, ey dostum,
Dur ertə namazına,
Əgər dirisən oyan,
Dur ertə namazına.

Namaz qıl yaraq olsun,
Axirətdə gərək olsun,
Qəbrində çıraq olsun,
Dur ertə namazına.

Namaz qıl imam ilə,
Etmə sən güman ilə,
Gedərsən iman ilə,
Dur ertə namazına.

Bu rəvayətin bir səbəbi də sübh namazının dəyərini insanlara xatırlatmaqdır. Sübh namazı çox qiymətlidir və onu qılmaq vacibdir. Bu barədə də maraqlı bir hədis də var: «Bir nəfər İmam Sadiqin (ə) yanın gəlib deyir ki, günah iş tutmuşam. İmam buyurur ki, danış, bir çarə taparıq. Adam təkrar-təkra israr edir ki, mən onu deyə bilmirəm, o qədər pis günah iş tutmuşam ki, dilim deməyə acizdir. İmam da ona yardımçı olmaq üçün bunu bilməyin vacibliyini izah edir. Adam nəhayət özünü bir təhər ələ alıb dərdini deyir. İmam buyurur: «Get, istiğfar elə, inşallah Allah bağışlayar, bir də bu günaha qayıtma». O gedəndən sonra İmam buyurdu: «And olsun Allaha, elə bildim sübh namazı qəzaya gedib».

Sübh namazıhəqiqətən  o qədər fəzilətlidir ki, Xızır peyğəmbərin bu namaz üzündən doğma övladlarına qarğışı Allah dərgahında qəbul olunub.

Sədi Şirazı deyir:

Namaz qılmayana borc vermə aman,
Aclıqdan şi kayət etsə də haman,
O, Allahın borcunu vermirsə əgər,
Bəndənin borcunu  de necə verər?!

Fikrimizi Hacı Soltanın Xızır nəbi barədə yazdığı şeirlə tamamlayırıq:

Qəlbə yetər nuri-səfa Xızrdən,
Xəstə tapar dərdə dəva Xızrdən,
Darə düşənlər çağırarlar onu,
Hacəti var olsa rəva Xızrdən.

Məskəni var Azəribaycanda,
Həqqə yetər həmdu səna Xızrdən.
Seyr eləyər yerləri, həm göyləri.
Feyzin alar ərzü səma Xızrdən.

Yavər olar dəhrdə bikəslərə,
Çünki gələr ruhə qida Xızrdən.
Abi-həyat çeşməsinə yol açıb,
Kamil olub mülki-bəqa Xızrdən.

Öyrədib İskəndərə hikmətləri,
Cilvələnib hökmi-Xuda Xızrdən.
Çox yetişib dadına aşiqlərin,
Razıdı şahi-şühəda Xızrdən.

Bayramına gör necə ellər gəlib,
Zövq aparır əhli-vəfa Xızrdən.
Süfrə açıb Soltan onun adına,
Bəlkə yetə həqqə nida Xızrdən.

Türkiyədə yaşayan qardaşlarımız da Xıdır nəbi bayramını qeyd edirlər. Sosial şəbəkələrdə bu barədə gözəl yazılar vardır. Onlardan birini olduğu kimi oxuculara təqdim edirik:

## ƏLƏVİLƏRDƏ XIZIR BAYRAMI

Ölümsüzlük suyunu içtiği için ölüp yeniden dirilebilir. Elbiseleri yeşildir. Bu anlamda doğayı simgeler. Hızır Ata da denir. Havada dolaşır, su üstünde yürür. Kılıktan kılığa girebilir. Doğadaki varlıklara söz geçirebilir. İnsanlara göründüğünde kendini tanıtmadığı müddetçe kimse onun gerçek kimliğini bilemez. İnsanları sınavdan geçirir, bazen bir derviş, bazen bir yoksul kılığına bürünür. Aç olduğunu söyler, iyilikle karşılık verenleri ödüllendirir, tam tersine kendini kovup açlığını gidermeyenleri cezalandırır.Türk mitolojisinde savaşlarda kurt kılığına girip öndere veya komutana görünür.Yaraları iyileştiren ilaçlar yapar veya içeriklerini tarif eder. Bazen kör olarak tarif edilir ama göze ihtiyacı yoktur, çünkü o kalp gözüyle her şeyi görür.

Merd-i meydan eylemektır iyi er
Gafil olma kardeş çerağın söner
Her gördügün Hızır bilmektir hüner
Hızır İlyas Şahı Merdan Alidır

Boz Atlı Hızır kimdir! Hızır kültü, orta doğudaki bütün halkların söylencelerinde vardır. Hızır ayında oruç tutulur, Cem bağlanır, ve Semah dönülür. Alevilik Cem ve Semah`da gizlidir. O kendisine sığınan herkesin kalkanıdır ( Zebur )

Alevi Kızılbaş Ocakzade'leri der ki !

Güneşimiz, yıldızlarımız ve dolun Ayımız odur. Bostanımız, sarayımız, meydanımız ve baş köşemiz odur. Kıblemiz, orucumuz, sabrımız odur. Bayramımız, niyazımız, lokmamız odur.

Hızır kültü, orta doğudaki bütün halkların söylencelerinde vardır. Hızır ayında oruç tutulur, Cem bağlanır ve Semah dönülür. Alevilik Cem ve Semah`da gizlidir. Cem ve Semah Cem Evinde yapılır. Cem Evi yoksa Talib ve Pir hangi mekanı uygun görürse Cem orada, o mekanda bağlanır. Anadolu'daki Kızılbaş Aleviler`de Hızır, özlem ve umudun atlısıdır. Alevi Kızılbaş inancında aşk ile beslenip ebedileşen Boz Atlı Hızır'dır. Ene'l-Hak çağuruban dara geleyim Mevlam, diyen bütün dervişler Boz Atlı Hızır' ın ölümsüzlügüne inanırlar.

İnancımızda en yüce ve ulu makamın sahibi olan bir erdir. Hızır Aleyselam veyahut Hızır Nebi, Boz Atlı Hızır olarakda çağrılır. Abu hayat, ölümsüzlük suyu içmiştir. Tabiyata can veren odur, darda kalanlara yardım eden odur. Ak sakallı bır Pir-i fanidir.Gezindiği yerlerde çayır çimen biter, güllük gülüstanlık olur. Uğradığı hanede bolluk ve bereket eksilmez. Rüyasına girdiği kişinin derdine derman, yarasına ilaç olur. Bin yıllardır Anadolu Alevileri bu inancını hep canlı ve saklı tutar. Anadolu Alevileri için bazen Ali görünmüş, bazen Pir Hünkar olarak gelmiş, vakti gelmiş Pir Sultan olup mazlumun yanında belirmiş. Alevi Ulularının canlı bedeninde görünen Hızır`ın kendisi olduğuna inanılır. Yeri ve zamanı geldiğinde insanı sorgulayan, yeri geldiğinde insanı ödüllendiren, dilekleri ve istekleri, özlemleri yerine getirdiğine inanılan, Anadolu Kızılbaş Alevi ve Bektaşilerin tanrı misyonunu yüklediği düş varlığıdır.

Dua okundu hazıra
Boz-At ile düşmüş yola
Destur verildi Hızır`a
Kara gözlüm cark ederek

O yüce dağlar gibi sığınıp, saklandığımız bir mekan gibidır. Bu evrenin oluşumundan beri kurumayıp, coşkuyla akan, kutsadığımız sudur.

Umutsuzlara umut kapılarını açtıran, insanlara kederi unuturup güldüren Boz Atlı Hızırdır. İnsan oğlu nerde dara düşse, onu yürekten çağırdımı mutlaka yetişendır. Diledimi kazandıran, ömürleri uzattıran, O her şeye muktedirdır.

Hızır ile ilgili bilgi almak için, Anadolu Kızılbaş Alevilerin yerleşim birimlerini gezip insanlarla konuşmak yeterlidır. Hangi Aleviye sorsanız, Hızır kimdır ? ne yapar diye, alacagınız cevaplar, ciltlerce kitabı dolduracak, anlam içeren deyim ve sözlerle karşılaşırsınız. Hızır her muradı veren, her haneye giren, her derde derman olan, halden anliyan, kanatkar olan, seven sevilen, bir damla su gibi gönüllere düşen, mum gibi yanıp aydınlatan, Aşk gibi sevdalandıran, Mutlulukla güldüren, yola düşüren, zoru başaran, dağları aşıran, düşmanı şaşıran, çig lokmayı pişiren, boşalanı dolduran, her makamda oturan, gamı kederi unutturan, abı hayat suyundan içip ebedi olan Hızırdır.

Hızırı sevmek ve ona gönülden inanmak onu ebedileştırmiştır. Anadolu Kızılbaş Alevileri, nasılki güneşin yeniden doğacağına inaniyorlar, Hızır'ında çağırıldımı gelecegine şühpe götürmez bir şekilde inaniyorlar.

Anadolu'daki Kızılbaş Alevilerin gelenekselleşmiş

inanç kültürü içinde en önemli ay Hızır ayıdır. Kış günleri başladımı, andoludaki bozkırları kar bir beyaz örtü gibi kapladımı, Ocak ayının ortasından Şubat ayının ortasına kadar dört haftalık süre hızır günlerinin habercisidir. Kışın şubat ayının ilk haftasından başlayıp şubat sonuna kadar, dört hafta boyunca Alevilerin yerleşim birimlerinde, üç gün oruç tutulur. Tutulan orucun kutsal gerekçesi binlerce yıl önceki mitolojik söylenceye dayanır. Nuhun gemisinin tufanda, fırtınaya yakalanması ve insanların bu felaketten kurtulmak için „Yetiş ya Hızır, bizi kurtar.“ Diye feryad edip yalvarmalarından dolayı duaları kabul olur ve fırtına diner, gemi ve içindekiler sağ salim kurtulurlar. O günden başlayarak kurtulan topluluğun üç gün oruç tuttuğu söylencesi günümüze kadar gelmiştir.

Alevilerin inanç önderleri bu ayda taliplerini ziyaret ederler. Cemler ibadetler, görgü ve görülmeler bu ayda yoğunlaşır. Talipler Pirlerinin yolunu gözlerler. Pirleri veya bağlı oldukları ocağın seyidi uzakta ise, ya haber gönderirler veyahut özel bir şekilde gidip Rahper veya Pirlerini köylerine getirirler.

Hızır ayında üç gün oruç tutulur.Kurban ve adaklar özelikle bu ayda yerine getirilir. Alevi Kızılbaşların en büyük bayram günleri bu günlerdır. Alevi yerleşim birimlerinde en hareketli ay ve insanların coşkuyla kaynaştığı günler bu aydaki Hızır günleridır. Dargınlıkların giderildigi, küskünlerin barıştığı, hak sahiplerinin haklarının verildigi, şikayetlerin dinlendigi, sorunlara hal çaresinin mutlaka bulunduğu kutsal ay bu Hızır ayıdır.

Hızırın ismiyle başlanıp onun rızası için hal edilmedik bir proplemin kaldığı hiç görülmemiştır ve duyulmamıştır. Pirin huzurunda bir müşkül hal edilecekse, taraflara Hızır aşkına razı olun denildimi, akan sular durur. Hızıra olan

itikat çırası her ikrar veren Alevinin gönlünde mutlaka yaniyor. Çünkü Hızıra olan bu yüce sevgi ve muhabetin mayası daha beşikten itibaren aşılaniyor.

Alevi aile geleneginde bu duygu aile bireylerine bir kilime nakış dokunur gibi sabır ve sevgiyle işleniyor. Her an ve her demde, hem söylemde hemde eylemde yalnız Hızır çağrılır.

Anadolunun duru ve hiç bir şekilde inancının törpülenmedigi bir Kızılbaş köyünde yaşiyanlar Hızırı nasıl yaşamlarına koymuşlardı ?

Yaşiyanlardan dinliyelim.

Alevilerde yeni doğan çocuğu annenin göksüne koyduklarında, çocuğu emzirmeye başladığı andan itibaren, Hızır korusun, büyütsün, kazadan, beladan korusun diye anne mırıldamaya başlar.Uyuturken büyütürken hep Hızır'dan sözeder. Sofrada yedirirken, elbise giydirirken hep dua eder, Kapıdan uğurlarken, eve döndügünde karşılarken, sarılıp öperken hep hızırın ismini zikir ederler. Evin içinde dolaşırken, yemek pişirirken,sofra sererken, hep o gönüllerin güneşi olan Hızırı anarlar.

Anadoludaki evlerin içinde bir killer olur ve orda evin yiyecekleri saklanır. Kışlık kavurma, yağ, peynir, çökelek, kurutulmuş tahıl ürünleri orda istif edilir ve bekletilir. Kiler kutsanır, oraya Hızır bereketini koymuştur. Her ne zaman killerden bir lokma alınsa Hızırın adı zikir edilmeden kaşık ve kepçe kulanılmaz.Küçük çocukların kendi başına kilerden bir şey almamaları için uyarılır, derlerki ordan Annenin haberi olmadan rızasız bir şey alırsan Hızır görür ve cezalandırır. Hızırın mühürü kilerdeki yiyeceklerin üstündedir, onun haberi olursa rüyanıza girer ve size darılır, veyahut güzel şeyler yaparsanız sizi sevindırır diye daima çocuklara telkinlerde bulunurlar. Bu telkin ve

sayısız söylencelerle büyüyen Alevi Kızılbaş ailelerinin cocuklarının gönlünde Hızır sevgisi mayalanır, kulaklarında kutsanmış bu hoş ses her zaman anıldıkca bir demet gelincik gibi yeşerir.

Hızır kültü bütün orta doğu halkların söylencelerinde vardır. Anadolu Kızılbaş Alevi bektaşilerin inanç ve kültüründe ise daha cok kutsanarak, bir başka anlamlandırılmıştır.

Merd-i meydan eylemektır iyi er
Gafil olma kardeş çerağın söner
Her gördügün Hızır bilmektir hüner
Hızır İlyas Şahı Merdan Alidır ( ş. Metin Baba )

Anadolu Alevileri kendi inançlarında Hızırı bir boz ata bindirerek,dağ taş, iniş yokuş, kar kış hep dolaştırmışlar. Alevilerin söylencesinde, bu özlemin atlısı iki kardeştır. Biri karalarda dolaşır ve dilekleri yerine getirir. Digeri Deryalarda dolaşarak darda kalanlara yardım eder. Anadolu Alevileri üç gün oruca Hızır İlyas orucu derler.

Hızır ayı gelince büyük bir istek ve arzu ile yüreklerdeki sevgi ve coşkuyla evlerin her tarafı temizlenilir ve cevreye bir daha çeki düzen verilir. Üç gün oruç tutulur. Oruca akşamdan niyet edilerek ve dilek tutularak yatılır. Bu dilek tutuş genelikle gençler arasında daha yagın olur. Rüyasına giren gençle evlenecegine inanılır. Genç gelinlerin erkek veya kız çocuğu sahibi olup olmıyacaklarına göre rüyalarında Hızırın haber verecegine inanırlar. Gurbette veya uzakta bekledilkleri birinden hayırlı bir haber verilecegine inanılarak bu üç günlük oruçta her akşam bu niyet ve dileklerle yatmadan önce aile büyüklerine niyaz edilir, duaları alınarak yatılır. Ertesi gün kendi aralarında

rüyalarını anlatıp yorum yaparlar.

Anadolunun kırsal Alevi yerleşim birimlerinde, kısa bir süre önceye kadar, orucun üçüncü gününün sonunda, Gavut denilen bir yemek pişirip kapu komşuyu çağırıp birlikte yerlerdi.

Bu yemek Hızır orucunun son günü, saçta kavrulan buğdayın el degirmeninde ögütülen unundan yapılır. Büyük bir sinni veya temiz bir örtü üzerinde, ince bir elekten gecirerek ununu elerler. Bu una el ayak degmiyecek bir yere konularak üzeri bir örtü ile örtülür. Ertesi gün örtüler dikkatlice kaldırılarak, bir el izi veya belirti olup olmadığına bakılır ve o haneye Hızırın uğrayıp uğramadığına işaret kabul edilir.

Pişen bu undaki yemegin içine tere yağı varsa ayrıca yağın içine balda katarak ayrı bir tad verilerek, Hızır yemegi diye her hanede bu yemek pişer ve aleviler biri birini ziyaret ederek bu lokmaları birlikte yerler. Kurban adağı olanlar kurbanlarını Alevili yolu icin can, bas vermis seyitlerine tekbirleterek keserler. Cem yaparlar.

Hızır günlerinde Alevilerde inancın doruğu yaşanır. En büyük bayram günleri bu günlerdır ve insanlar sevinç ve mutluluktan bedenen, manevi haz alarakta ruhen doyuma ulaştıkları tek ay Hızır ayıdır.

Aleviler ona, Hızır Pegamber, Hızır Nebi, Hızır Aleyhisselam denilen isimlerle seslenirler. Yaşadıkları coğrafiyada yüzlerce mekanlara onun ismini vermişler ve o mekenları kutsamışlar. Hızır çeşmesi, Hızır dağı, Hızır geçidi, Hızır yaylası, Hızır duvarı, gibi sayısız isimlerin verildikleri bu mekanlar insanlar tarafından beli dönem vegünlerde ziyaret edilir dualar edilerek dilek temeni ve istekler dile getirilir. Hızır ayağının degdigi toprak canın mutluluğudur. Bastığı toprak gül ve yasemin olmuştur.

Cihanda onun huyundan daha üstün bir güzellik yoktur. Onun katında barınmiyan bir gönül, gönül degildır. Hızır halk efsanelerinde ak sakallı, nur yüzlü, gülen gözlü biri olarak, sırtında abası,elinde asası olan biri olarak tarif edilir.

Alevi kızılbaş inancında, kerem sahibi, olan odur.Gamlı ve kederli günlerde en umutsuz anlarda dahi bütün kapılar kapansada, ona giden kapıya yol bulunur ve o kapı açıktır. Çünkü umutsuzların kapısıdır ve orada ebedi sönmeyen itikat çırası yaniyor.

İkrar verip Aşk kabesindeki duraklarda duranları gören, orda kopan feryadları duyan Hızır'dır. Aşıkların, Pirlerin dilinde O aşkın sakisidir. Aşıklar mana aleminde onun elinden aşkın dolusunu içerler.

Açları doyurucusun
Haklıyı kayırıcısın
Kavgayı ayırıcısın
Yetiş ya Bozatlı Hızır.
( Aşik İhsani )

Hızır ayında bütün Alevi Dedeleri, Alevilikteki bütün değerleri özünü bozmadan güzel anlatmalıdırlar. Gözümüz gibi koruduğumuz HAKDER ve ona bağlı birimleri yukarıda deyindiğimiz konular hakkında duyarlı davranırlarsa, özverili çalışırlarsa bu yüce inancın değerleri bozulmadan bizden sonraki nesile, çocuklarımıza güzel bir miras olarak kalır. Hızır ayında Piri ile muhabbeti ibadet kabul eden cümle canların, dildeki dileklerinin, kabulu bizim muradımızdır. Boz Atlı Hızır cümle Canların muradını vere.

## BOZ ATLI HIZIR

Umutsuzların umudu
Yetiş ya Bozatlı Hızır
Gaip erenlerin adı
Yetiş ya Bozatlı Hızır

Bereketi veren sensing
Ağları güldüren sensing
Menzile erdiren sensing
Yetiş ya Bozatlı Hızır

Yolcuya yolunu açan
Dertlilere derman saçan
Günahtan kusurdan geçen
Yetiş ya Bozatlı Hızır

Açları doyurucusun
Kavgayı ayırıcısın
Haklıyı kayırıcısın
Yetiş ya Bozatlı Hızır

Haksın ve hakkın varlığı
Aydınlat bu karanlığı
Zalime göster darlığı
Yetiş ya Bozatlı Hızır

İSYANİ gönül katında
Hem derviş hem pir zatında
Hem zahirde hem batında
Yetiş ya Bozatlı Hızır.

# ÇƏRŞƏNBƏLƏR

Xıdır nəbi bayramından sonra əsas çərşənbələr başlayır. Novruza qədər çərşənbələri müəyyən edən tarixi hadisələrin hər birinin kökü və onların su, od, torpaq və hava ünsürləri ilə şərtlənməsinin səbəbləri var. Demək heç bir şeydə təsadüfilik yoxdur. Odur ki, bu bayramı bir millət, bir xalq deyil, bəşəriyyəti Yaradan yaradıb. Odur ki, onun atributları da insanlar tərəfindən deyil, Allahın əmri ilə yaranır.

***

Bu çərşənbələr qışın boz ayına təsadüf edir. Belə ki, kiçik çilə qurtardıqdan dərhal sonra ilk çərşənbə olan su çərşənbəsi başlayır. Sonra  Od, Torpaq , Yel çərşənbələri qeyd edilir.

Bəzi qədim inanclara görə kainat 4 ünsürdən - su, od, torpaq və küləkdən yaranıb. Hər il 4 çərşənbə Novruzdan, günün bərabərləşməsindən əvvəl qeyd olunur. Aşıqlar da "Ab, atəş, xak, badan yarandım" deyiblər vücudnamələrində, yəni su, od, torpaq və yelə bağlıdır insan.

Birinci su çərşənbəsi adlanır. Su çərşənbəsi Novruz bayraminin ilk çərşənbəsidir. Bu çərşənbəni "Əzəl Çərşənbə", "Sular Novruzu" da adlandırırlar. Su çərşənbəsində su və su mənbələri təzələnir, arxlar qaydaya salınır. Su hövzələrində abadlıq işləri görülür, su ilə bağli müxtəlif şənliklər keçirilir. Su ilə bağli inaclarda deyilir" Süfrəyə su dağılması aydınlıqdır, Su içən adamı qəfil vurmazlar, Su içən adamı ilan vurmaz. Bir çox atalar sözündə də suyun müqəddəsliyi əks olunur: Su olan yerdə dirilik olar, Su ehsandır, Su murdarlıq götürməz, Suyu çirkləndirənin

nəşini yumağa su tapılmaz. Bahara doğru çayların azacıq buz bağlayan yerləri əriyib çaylara tökülür. Torpaq yavaş-yavaş islanmağa başlayır. Qızlar bulaqlardan sərin, şirin su gətirərdilər, evin ətrafına çiləyərdilər, üzlərini yuyardılar.

İkincisi od çərşənbəsi adlanır. Ona görə ki, bahara doğru günəş yavaş-yavaş torpağı qızdırır, isindirir, onu yaratmaq üçün hazırlayır. Od çərşənbəsində tonqallar qalayardılar. Hər ailə üzvünün adına bir şam yandırardılar. Xonçalar düzəldilərdi.

Üçüncüsü torpaq çərşənbəsidir. Torpağı ana təbiət su ilə islatdı, günəşlə isitdi, onu yaratmağa hazırladı. Ona görə də ilk yaz əkinini xışla-kotanla məhz torpaq çərşənbəsi günündə başlayardılar. Yaşlı qadınlar "Səməni, saxla məni, ildə göyərdərəm səni" deyib buğda isladardılar.

Dördüncüsü yel çərşənbəsidir. Yəni yel artıq azacıq oyanmış torpağı, təzəcə çıxmış yaza həsrət gülləri tərpədir, tumurcuqlanan ağacları yellədir.

Şəki-Zaqatala folklorunda çərşənbələrin öz adı və müddəti vardır. Çillə-beçə 10 gün olur, 20 fevral-2 martda hava havaya enir, yəni hava istiləşir. Bu yalançı çərşənbə ilə birinci həqiqi çərşənbədir. Xora beçə 5 gün olur, 2-7 martda hava suya enir, su istiləşir, buzlar əriyir. Bərdəsüz 5 gün olur, 7-12 martda hava yerə enir, torpaq isinir. Bu zaman səməni göyərdilir. İlaxır çərşənbə 3 gün olur. Hava ağaca enir, otlar, kollar, ağaclar göyərir.

Axırıncı çərşənbə digər çərçənbələrdən özəlliyi ilə fərqlənir. Belə ki, həmin gecə ilə bağlı bir sıra inamlar vardır. Onlardan bir neçəsini oxuculara təqdim edirik:

***

İlaxır çərşənbədə tezdən axar çayın içindən xırdaca daşlar götürüb unluğa, çörək təknəsinə, yağ qablarına qoyardılar. Gələn Novruz bayramına qədər onlara dəyməzdilər. "Daşlar nə qədər ki, öz yerindədir, o evdən bolluq əskik olmaz" deyərdilər.

İlaxır çərçənbə səhər sübh açılmamış gedərdilər çaya. Suyun üstündən tullanar, suyun içindən çınqıl yığar, ağacdan çöplər kəsib sapla bağlar, su qablarını doldurub gətirərdilər. Suyu həyətə səpər, çöpləri boşqablara, çınqılları buğdanın içinə, çörək taxçasına, yağ qabına, pul kisəsinə qoyardılar ki, evə bərəkət gəlsin.

İlin axır gecəsi axar sular dayanır, bir an axmır, suyun kənarındakı bitkilər başını əyib suya səcdə edir. Həmin anda sudan götürülür və Zəmzəm suyu kimi qəbul olunur.

Il təhvil olan anda bir yumurta, bir qırmızı və bir qara karandaş götürüb çay qırağına qoyar və arzu tutarlar. Səhərisi gedib baxarlar, əgər yumurtanın üstünə qırmızı xətt çəkilmişsə, arzunun yerinə yetəcəyinə, qara xətt çəkilmişsə gerçəkləşməyəcəyinə inanarmışlar.

İl təhvil olanda su dəyişir, təzə sudan gətirib evə, həyətə, tövləyə səpərlər, evdə yatanların gözünə tökərlər və aydınlıq olacağına inanarlar.

İlaxır çərşəndə gecəsi qızlar çoxluca duzlu kökə yeyər, su içməmiş yatarmışlar. Yuxuda hansı küçədən, həyətdən su içsələr, qismətlərinin orada olmasına inanarmışlar.

Axır çərşənbə gecəsi qızlar güzgü tutar, ayın şəkli düşərmiş güygüyə. Şəkildə sevdiyi oğlan görünsə, evlənəcəklərinə inanarmışlar.

***

“Sarıtel” verilişinin aparıcısı filologiya üzrə fəlsəfə doktoru, əməkdar mədəniyyət işçisi Elxan Məmmədli Novruz bayramı ilə əlaqədar söhbətlərində həmişə çərşənbələrin məhz aşıq ədəbiyyatında olduğu kimi (ab-su, atəş-od, xak-torpaq, bad-külək) sıralanmasının düzgün olduğunu qeyd etmişdir.

Bu günlərdə Dirili Qurbani Məclisinin sədri, şair-publisist Yusif Dirili çərşənbələrlə bağlı maraqlı bir diskussiya təşkil etmişdir. Sosial şəbəkələrdə bir çox fərqli fikirlərlə qarşılaşdıq. Sual belə idi: İlaxır çərşənbəsi yel çərşənbəsidir, yoxsa torpaq çərşənbəsi? Ümumiyyətlə, çərşənbələr hansı ardıcıllıqla düzülür, bunlar barədə nə üçün dəqiq bir sıralama mövcud deyil? Sorğuda iştirak edənlərin əksəriyyətinin cavabı sonuncu çərşənbə barədə belə olmuşdur: İlaxır çərşənbəsi yel çərşənbəsidir. Boz ay su çərşənbəsi ilə başlayır, ikinci çərşənbə od çərşənbəsi, üçüncü torpaq, sonuncusu yel, külək çərşənbəsi hesab olunur.

Odur ki, Yusif müəllim təklif edir ki, mümkünsə bu sıralamanı hamı bu cür qəbul edib, olduğu kimi də qeyd etsin. Bu barədə məlumatsızlar da məlumatlandırılsın ki, mübahisə doğurmasın. Yusif Dirili yazır:

Novruz gəlir naz ilə,
Allı-güllü yaz ilə.
Quşlar verib səs-səsə,
Oxur xoş avaz ilə.

# NOVRUZ SƏNDƏN ULUDUR

Abu, ataş, xaki, bad - təbiət ülvi, təmiz
İlaxır Çərşənbəylə Novruz yaranıb əkiz.
Qoşa bayram, baş bayram, milli, müqəddəs bayram,
Təbiətin doğduğu bakirə nəfəs bayram.
Təbiətə inamın insanda gücünə bax,
Onunçün də uludur Novruz hamıdan qabaq.
Təbiətləşir insanlar, insanlaşır təbiət,
Başa varır hər arzu, başa varır hər niyyət.
Hər fəslin öz anı, hər dövrün öz zamanı,
Gəlir Novruz bayramı, tutub düzü-dünyanı.
Nimçələrə düzməli, şəkərbura, paxlava
Al boyanmış yumurta, bir də səməni halva.
Plov üstə düzməli çay xanısı, ağ balıq-
Nəyin varsa gətir düz, olmaz varlığa darlıq.
Yemişi də yanında xurması, kişmişi var
Götür nəyi istəsən, xonçada var hər nübar.
Yanır rəngbərəng şamlar, niyyətlər hasil olsun,
Qulaq faılına çıxsan qəlbin xoş sözlə dolsun.
Od üstündən atlanmaq qoy çıxmasın yadından
Kimsə saxlayammasın səni bu inadından.

Bax, ev-eşik tər-təmiz , səliqə-sahmandı yer
Çoxlu pöhrə əkilmiş ürək istəyən qədər.
“Kosa-kosa” oyunu; qodu gəzsin, “dilənsin”
Cəmi-cümlə yığılsıın; desin, gülsün. əylənsin.
“İynəsalma” oyunu - bəxtin gülsün üzünə,
Oğlan nişan aparsın filankəsin qizına.

Papaq, torba atılsın qapılardan içəri, -
“Doldurmuşuq heybəni, çıx qəflətdən, gəl bəri.”
Qara zurna, ney səsi, yallı getsin cavanlar,
Çiçək qızlar önündə qurşaq tutsun oğlanlar.
Novruz gəlir, xoş gəlir, qəlbim gəlir riqqətə
Bir dənədir, təkcədir, layiqdir hər hörmətə!
Aldanma sən dinçinin sözünə, əməlinə
O, yalana təşnədir, salar səni felinə.
Gəl, sən də ey şarlatan, saxla fitvanı-zadı
Novruzu bizdən edən həşiri, qərardadı.
Yoxsa, güman edirsən kasıblıq əyir bizi,
Vermərik əlimizdən “qətl günü” Novruzu.
Zənn eləmə, yoxsuluq, varımız-mənimizdir,
Novruz səndən uludur, Novruz dünənimizdir!

# Ş.İ.XƏTAİ YARADICILIĞINDA BAHARIN TƏSVİRİ

Allah-təalanın bəşəriyyətə son olaraq göndərdiyi axirəz zaman peyğəmbər Həzrəti-Mühəmmədin (s) həqiqi canişini və vəsisi olan, Kəbə evində dünyaya gələn möminlər ağası Həzrəti-Əlinin (ə) əqidə və məslək davamçısı olan, 6 yaşında şeyx, 13 yaşında şahlıq taxtına əyləşən, 235 illik Azərbaycan Səfəvilər Dövlətinin əsasını qoyan, doğma Azərbaycanın birliyi, bütövlüyü uğrunda mübarizə aparıb böyük qələbələr qazanan, bütün dünyada şöhrət tapan, görkəmli dövlət xadimi, elm və iman fədaisi, Əhli-beyt (ə) aşiqi, dini və dünyəvi elmlərin və ozan-aşıq sənətinin dərin bilicisi olan Şah İsmayıl Xətai insanın yaradılış mayası olan 4 ünsürdən söhbət açaraq yazmışdır:

Abu, atəş, xaki, baddan xəlq oldum,
Kəndi-kəndim ana rəhmində buldum,
Müddət tamam oldu, dünyaya gəldim,
Bu ibrətnümayi cahandan aldım.

Ş.İ.Xətai fəsillərin gözəlliklərini dəfələrlə qələmə alıb. Lakin bahar fəslinin gözəlliklərini qələmə alarkən şair bütün qüdrətini səfərbər edib, insana və təbiətə olan məhəbbətini “Dəhnamə” (“On məktub”) adlı “məsnəvi”sində ümumiləşdirmişdir.

“Dəhnamə” məsnəvisinin müqəddiməsində şairin qələmə aldığı “Sifəti-gülşəni-bahar” adlandırdığı “Bahariyyə” Azərbaycan ədəbiyyatı tarixində təbiət təsvirinin ən gözəl nümunəsidir. 122 misradan ibarət olan

bu təsvir müşahidələrin dəqiqliyi, rəngarəngliyi, təzəliyi və təravətli olması ilə indi də insanı heyrətə salır, oxucuda şən əhval-ruhiyyə oyadır. Bu təsvirlər o qədər dəqiqdir ki, rəssamlar onun əsasında heç bir çətinlik çəkmədən çoxlu lövhələr yarada bilərlər. Ədəbiyyatşünaslığımızda "Bahariyyə" adlı janra bir qayda olaraq Ş.İ.Xətainin həmin təsviri ən səciyyəvi nümunə kimi göstərilir. Ədəbiyyatımızda çoxlu təbiət təsvirləri yaradılmasına baxmayaraq, Xətainin yaratdığı "Bahariyyə" belə təsvirlər içərisində müstəsna yer tutur. İlk misralardan başlayaraq həmin lövhələr insanı valeh edir. Şair "Sifəti-gülşəni- Bahar" (Bahar gülşəninin təsviri) əsərində baharı belə vəsf edir:

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.
Quşlar qamusu fəğanə düşdü,
Eşq odu yenə bu canə düşdü.
Yer geydi qəbayi xizrpuşan,
Cümlə dilə gəldi ləbxəmuşan.
Sərvin yenə dutdu damənin su,
Su üstə oxudu faxtə gu-gu.
Qönçə dəhəni çəməndə xəndan,
Gülmaxdan ənar açıldı dəndan.
Bülbül oxudu sifati-hicran,
Dəryadə dür oldu əbri-neysan.
Durna uçuban həvayə düşdü,
Laçın aluban ovayə düşdü.
Alma ağacı dibində sayə,
Tən eylər did bulutda ayə.
Yaşin yerə tökdü əbri neysan,
Bülbüllər oxudu səd hezaran.
Mey bəslədi jalə hər vərəqdə,

Türrac kitab oxur təbəqdə.
Qum-qum der idi ağacda qumri,
Məst oldu bənövşə içdi xəmri.
Şax üstə qabaqlar hali,
Qu gərdənindən verür misali.
Quş beççələri ünü yuvadan
Məktəb ünü tək gəlür həvadən.
Boyandı zəmin hezar rəngə,
Övraqi -şəcər də təngə-təngə.
Nilufər açıldı, suyə girdi,
Pirahənini başına sardı.
Çinar əlini çü pərsə açdı.
Gül xurda zərin şəbaşə saçdı.
Çaylar bulandı, yıxdı arxın,
Bağlar ağacı gögərtdi şaxın,
Gilas ağacı dibində mahüm,
Çün mah idi dər miyani-əncüm.
Yüz dürlü qəba geyib çəmənlər,
Ağ donunu geydi yasəmənlər.
Şax üstə şükufeyi -şəcərlər,
Musa əlidən verür xəbərlər.
Sirabi gülün yüzündə abi,
Nərgis oturur gözündə xabi.
Hər ğönçədə vərdi-ərğəvani,
Qumri gözüdən verür nişani.
Ta çalmaya dan yeli tapinçə,
Yüzinə niqabın örtdü ğönçə.
Yaşıl çəmən üstə jalə çin-çin,
Əxzər fələk üstə pəşki-Pərvin.
Sərv etdi çəməndə sərfərazi,
Gül cilvələnir başında nazi.
Çıxmış budağ üstə əndəlibi,

Mənbərdə oxur çəmən xətibi.
Cular axıdır çəməndə hər su,
Nərgis gülünün gözündə uyxu.
Lalə oturur başında taci,
Heç sərvərə yoxdur ehtiyaci.
Sünbül daramış başın be şanə,
Ənbər qoxusun qılur fəşanə.
Cular axıdır kənari-bağdan,
Su içməgə ahu gəldi dağdan.
Lalə gecələr yaxıb çirağı,
Aşiq cigərinə çəkdi dağı.
Naz ilə bəzəndi bağ sərvi,
Sancıb başına dümi-təzərvi.
Güllər vərəqinə doldu şəbnəm,
Çün birgeyi -hövzi-abi-zəmzəm.
Al ilə yaşıl geyindi bağlar,
Ağ ləçəgi, sərpə saldı dağlar,
Susən qılıc aldı, bid xəncər,
Eyş etməyənin gözinə sancər.
Pərvaz qılur havadə turğu,
"Ya rafe" oxur, kimisi yahu.
Sayrar ağac  üstə yüz sığırçın,
Ahəng dutar ona gögərçin.
Əsməkdə nəsimi -ənbərəfşan,
Yaprağnı qılur budağda lərzan,
Ötkün quşu köçdü, qıldı pərvaz,
Durnavü ütabü qurqura, qaz,
Murçinü cürəvü nərgə, sona.
Yaydı  qanadın ki, gölə qona,
Kəklik gülür idi,dağda qah-qah,
Bayquşlar oxurdu "li məallah".
Sərv öz ayağına sayə salmış,

Zilli-saçını hümayə salmış.
Novruz gülünün açıq dəhanı,
Mürğ anda hezar oxur zəbanı.
Daylar tülədi, buraxdı yalı,
Kişnər çalağan qulun misalı.
Quzladı qoyin, töküldü döllər,
Yaylağ həvəsini qıldı ellər.
Düşmən qanı tək qızardı hər su,
Ötkün saruya yeridi ahu.
Biri-birini qavur geyiklər,
Bala dölümün qılur peyiklər.
Durmuş çəmən üzrə sərv ayağə,
Qılmığa təmaşa solü sağə.
Gül duxtərinin ərusi yetmiş,
Gülgün duvağın başına örtmüş.
Ahu quzu doydurub uyutdu,
Oğurlanıb özü ota getdi.
Səhrayə buraxdı nafə ahu,
Xaki-siyəh oldu müşki-xoşbu.
Durna uçub ün çəkib havadə,
Gedər ünü qırx ağac ziyadə.
Bağrı qaranın qarardı bağrı,
Şahbaz ona varanda doğri.
Quşlar yuvadan uçurdu balə,
Ahu yenə sür verür ğəzalə.
Çıxdı günəşə yer əjdahası,
Buynuzunu saldı dağ buğası.
Hər bir çiçək üstə qondu zənbur,
Dövşürməgə çıxdı danəsin mur.
Hər şey günəşə qurutdu yaşin,
Qövsi-qüzeh açdı tər qumaşin.
Şəb cü-cü edir ağacda sərçə,

Uçanda, qonanda beylə parçə.
Yarpağı ağaclar üstə lərzan,
Kimisi çü tir, kimisi peykan.
Şəh tuti oxur şəkər kəlamin,
Qənd ilə pür etdi bəndü damin.
Döndü vətəninə cümlə quşlar,
Gəldi yuvasına qırlaquşlar.

Ş.İ.Xətainin "Bahariyyə" məsnəvisinin daha anlaşıqlı olması üçün onu nəzmdən nəsrə çevirərək oxuculara təqdim edirik: "Qış getdi, bahar gəldi. Gül bitdi, laləzar oldu. Quşlar fəğanə gəldilər, yəni cəh-cəh vuraraq oxudular. Eşqin odu cana düşdü. Yer Xızır kimi yaşıl geydi. Danışmayanlar dilə gəlib danışdı. Sərvin ətəyin su tutdu. Alabaxta (çöl göyərçini) sərvin üstündə oxudu. Çəməndə nar ağacı çiçək açdı. Bülbül ayrılığa vida nəğməsi oxudu. Neysan suyu gövhərə çevrildi. Durna havalanıb uçdu, Laçın ova çıxdı. Alma ağacının dibindəki kölgə bulud ilə aya rişxənd edirdi. Neysan yağışı yağdı, minlərlə bülbül oxudu. Hər yarpaqda şeh mey bəsləyirdi. Turac da hər yarpağı vərəq edib kitab oxuyurdu. Ağacda qumru "qum-qum" deyə oxuyurdu. Bənövşə şərab içib məst olmuşdu. Balqabaqlar tağda açıla qalıb qu quşunun boynundan xəbər verirdilər. Quş balaları yuvadan məktəb uşaqları kimi səs-səsə verirlər. Torpaq min rəngə boyandı, ağac yarpaqları pul-pul oldu. Nilufər açılaraq libasını başına bürüdü və suya girdi. Çinar əlini açaraq rəqsə başladı. Gül ən xırda qızılını şabaş atdı. Çaylar bulanıb səddi aşdılar, bağlarda ağacı və budaqlarını yaşıllaşdırdılar. Çəmənlər yüz cür paltar geyindilər, yasəmənlər ağ dona büründülər. Sudan doymuş gülün üzündə su vardı, nərgiz yuxulu halda oturmuşdu. Hər qönçədə qumru gözü kimi qırmızı

yarpaq var idi. Dan yeli üzünə şillə vurmasın deyə, qönçə üzünü niqab ilə örtdü. Yaşıl çəmən üstə düzülmüş şeh damlaları yaşıl səmadakı Pərvin ulduzunu qısqandırırdı. Sərv çəməndən başını ucaltdı, gül cilvələnib naz etdi. Çəmən xətibi olan bülbül budağı minbər edib üstündə oxuyurdu. Hər su çəməndə arxa dönmüşdü, nərgis gülünü yuxu tutmuşdu. Heç bir sərvərə ehtiyacı olmayan lalə başına tac qoyub oturmuşdu. Sünbül saçını daraq ilə darayıb ənbər ətrini yayırdı. Bağın kənarında arx axırdı. Ahu, dağdan enib, su içməyə gəldi. Lalə gecələr çırağını yandırıb aşiqin ciyərinə dağ çəkirdi. Bağ sərvi naz ilə bəzənib başına qırqovul quyruğu sancdı. Zəm-zəm hovuzun suyu kimi gül yarpağına şəbnəm doldu. Bağlar qırmızı, yaşıl don geyindi, dağlar ağ ləçəyin sərdilər. Şənlənməyənlərin gözünə sancmaq üçün süsən qılınc götürdü, seyid isə xəncər. Ağac üstündə yüz sığırçın oxuyar, göyərçin də onlara qoşular. Səhər yeli ənbər ətri yayayraq əsir, budaqda yarpaq titrədir. Köçəri quşlar olan durna, qaranquş, qurqura, qaz uçub köçdülər. Sona qanadını yığıb gölə qondu. Kəklik dağda qah-qah çəkib gülürdü, bayquşlar "liməallah" (Allahdan başqa məbud yoxdur) deyə oxuyurdular. Sərv öz saçı ilə ayağına kölgə salmışdı. Novruz gülünün ağzı açıq qalmışdı, quş min dil ilə orada oxuyurdu. Dayçalar tüləyib yol buraxdı, çalağan qulun kimi kişnədi. Qoyun döl töküb quzuladı, ellər yaylağa çıxdılar. Hər su düşmən qanı kimi qızardı, ahu ötgünə sarı getdi. Geyiklər(dağ keçisi) bir-birini qovmağa başladılar. Sərv çəməndə ayağa durub sola-sağa tamaşa edirdi. Gülün qızı gəlinlik çağına yetmişdi, ona görə də qırmızı duvağını başına örtmüşdü. Ahu öz balasını yuxuya verib, ot dalınca getdi. Öz göbəyindən səhrayə nafə buraxdı, qara torpaq müşk ətri verdi. Durna havada elə səda verdi ki, 40 ağac ətrafa yayıldı. Tərlan

bağrıqaraya doğru uçanda bağrıqaranın bağrı qaraldı. Quşlar balalarını böyüdüb yuvadan uçurtdu. Ahu isə yenə də balasına süd verir. Yer əjdəhası günəşə çıxdı, dağ buğası buynuzunu salladı. Hər bir gülün üstünə bir arı qondu, qarışqa dən dalıyca çıxdı. Hər şey öz nəmliyini günəşin altında qurutdu, göy qurşağı tər qurşağını açdı. Yarpaqlar ağaclarda titrədi. Kimisi ox kimiydi, kimisi də oxun ucuna taxılan dəmir kimi. Tutuquşu şirin-şirin oxuyaraq öz qəfəsini qənd ilə doldurdu. Cümlə quşlar vətənlərinə döndü”.

## MÜXTƏLİF XALQLARDA NOVRUZ BAYRAMI

Novruz bayramı - Azərbaycanda - Yeni Gün bayramı, Bahar bayramı kimi məşhurdur. Fars-tacik dilində isə - (Noruz) adlanır. Özbəkistanda - Navruz, Türkmənistanda - Noşruz, Qazaxıstanda - Naurız, Qırğızıstanda- Nooruz, Türkiyədə - Nevruz, Krım tatarlarında - Navrez adlanır.

Novruz bayramı Şimal yarımkürəsində astronomik yazın başlandığı, gecə-gündüzün bərabərliyi günündə (martın 20-si, 21-i və ya 22-sində) keçirilir. Bir sıra xalqlar yaz fəslinin gəlməsini təbiətin canlanması ilə bağlamış, bu münasibətlə şənliklər keçirmiş, onu yeni ilin başlanğıcı kimi bayram etmişlər. Qədim zamanlardan başlayaraq Azərbaycan, İran, Əfqanıstan, Tacikistan, Özbəkistanda və bir çox şərq ölkələrində baharın - yeni ilin gəlişini şənliklərlə qarşılayırlar. Martın 21-i İran və Əfqanıstanda rəsmi təqvimin ilk günü sayılır. Tarixi çox qədim olan Novruz bayramı hər il xalqımız tərəfindən böyük təntənə ilə qeyd olunur. Novruz bayramı yeni ili,baharin ilk gününü qarşılamaq deməkdir. Günəş dünyanin cənub yarımkürəsindən şimal yarimkürəsinə keçdiyi vaxt gecə ilə gündüz bərabərləşir...

Bu vaxt qış qurtarır,Yaz fəsli başlayır. Elə Novruz bayramı da bu gündə keçirilir. Deməli, Novruz bayramı əslində yazın, baharın ilk günü, təbiətin canlanması, torpağın oyanması bayramıdır.

Azərbaycanda adətə görə, Novruz bayramında göyərdilən səməni yazın gəlməsinin, təbiətin canlanmasının, əkinçiliyin rəmzidir. Azərbaycan kəndlisi səməni göyərt-

məklə növbəti təsərrüfat ilinə bərəkət, bolluq arzulamış, bayrama dörd həftə qalmış, hər çərşənbə axşamı və bayram günü tonqal qalamaqla, mahnı ("gün çıx!" nəğməsi və s.) qoşmaqla oda, atəşə, günəşə olan etiqad və inamını ifadə etmişdir. Bütün bu mərasimlər İslamdan çox-çox əvvəl mövcud olmuş qədim şərq ənənələrinin davamıdır.

Xalqımıza xas olan Novruz deyimləri belədir:

Novruz mətləbini versin
Novruz gülünə dönəsən
Novruz payı yeyəsən
Novruz üzünə gülsün
Novruzda bəxtin açılsın
Novruz xonçan düşərli olsun
Novruz köməyin olsun
Ürəyin Novruz qədər geniş olsun.

2009-cu il sentyabrın 30-da Novruz bayramı YUNESKO tərəfindən qeyri-maddi mədəni irs siyahısına daxil edilmiş, 23 fevral 2010-cu ildə isə BMT Baş Assambleyasının 64-cü sessiyasının iclasında mart ayının 21-i "Beynəlxalq Novruz Günü" elan edilmişdir. Novruz bayramı Azərbaycanda geniş miqyasda qeyd olunduğu üçün bayram ərəfəsi qeyri-iş günləri elan olunur. Novruz bayramının mənşəyi qədimdir. İslam dini Yaxın Şərq və Orta Asiya ölkələrində yayıldıqdan sonra Ərəb xilafəti bu ölkələrin xalqlarının adət-ənənələrini, bayramlarını təqib etməyə başladı. Həm də və ən əsası da İmam Əlinin (ə) taxta çıxdığı vaxtı biz “Cənabi-Əmir” bayrami kimi qeyd edirik. Əksər xalqlar bahar bayramının əsl mahiyyətindən doğan bir sıra adət-ənənələri, oyunları indiyədək saxlamışlar.

Orta əsr müəllifləri Şərq ölkələrində İslam dini yayıldıqdan sonra da Novruz bayramında yaz ənənələrinin, əkinçilik təqvimi etiqadlarının möhkəm yer tutduğunu göstərirlər. Əbu Reyhan Biruni Novruz bayramı haqqında müxtəlif rəvayətlərdən, onun yaranması səbəblərindən, bu bayram münasibətilə xalq arasında yayılmış adət-ənənələrdən bəhs etmiş, Novruz bayramının təbiətin oyanması, əkinçilik təsərrüfatının başlanması ilə bağlı əsl dünyəvi bayram olduğunu qeyd etmişdir.

Nizamül Mülk "Siyasətnamə" əsərində Novruz bayramından yazın gəlişi ilə əlaqədar keçirilən kütləvi xalq bayramı kimi bəhs etmişdir. Novruzun gəlişi klassik Şərq, o cümlədən Azərbaycan poeziyasında geniş yayılmış "Bahariyyə" adlı lirik şeirlərdə də təsvir və tərənnüm edilir.

Əməkdar jurnalist Flora Xəlilzadə “Bahar nə xoş gəlir” adlı məqaləsində Novruz bayramı haqqında dəyərli fikirlər səsləndirir. Tarixə müraciət edərək yazır: “XVII əsrdə yaşamış fransız səyyahı Jan Şardən Şərq ölkələrini səyahətə çıxır. Gəncədə, Naxçıvanda, Tiflisdə, İrəvanda, Təbrizdə, İsfahanda olur... Vətəninə qayıtdıqdan sonra "Səyahətnamə" adlı kitab yazır. Maraqlıdır ki, onun səfərlərindən biri mart ayına düşdüyündən, o, Şərqdə qeyd edilən Novruz bayramında iştirakçısı olub. Həmin bayramla bağlı "Səyahətnamə"sində bildirib ki, Səfəvilərdə dini və mülki bayramlar lap çoxdur. Bu bayramlardan üçü təntənəli surətdə qeyd edilir: Orucluq, Qurban və Yaz bayramı. Yaz bayramı əslində Yeni il bayramı deməkdir. Həmin gün gecə ilə gündüz bərabərləşir. Fransız səyyahını heyrətə gətirən yumurtaların qızıl suyuna boyanması və insanların bir-birlərinə nadir tapılan, həm də bahalı əşyalardan - cəvahiratdan, qızıldan, gümüşdən, parçadan, ətriyyatdan, daş-qaşdan hədiyyə verməsi olub. Bu cür bayramlaşmanın

əkinçidən şaha qədər davam etməsi avropalı səyyahını daha çox heyrətləndirib. Xüsusilə də İrəvan bəylərbəyliyində keçirilən Novruz bayramı Jan Şardəni valeh edib. Səyyahı təəccübləndirən amillərdən biri də insanların bayramın birinci günü Allaha dua etmələri olub. Jan Şardən yazırdı: "Onlar sübh çağı bütün bədənlərini su ilə yuyurlar. Sonra tərtəmiz paltar geyinirlər, xoş sözlər danışırlar, bir-birləri ilə mehribançılıq edirlər. Bu ovqat onlarda Yeni ilin xoş keçəcəyinə, xoşbəxtlik gətirəcəyinə inam yaradır".

Novruz bayramında müxtəlif oyunlar keçirilir. Bunlara artırma, halay, bənövşə, cıdır, ənzəli, Kosa-kosa və bu kimi oyunlar aid edilir.

Novruz bayramında xüsusi şirniyyatlarda bişirilir. Çərşənbə və bayram xonçaları bu şirniyyatlarla bəzədilir. Bayramda bişirilməsi mütləq olan şirniyyatlar bunlardır, qoğal, şəkərbura, badamburan, paxlava. Hər bir bişirilən şirniyyatlar bir səma cisimlərinə bənzədilir. Qoğal günəşi, şəkərbura ayı, paxlava ulduzları tərənnüm edir.

Kosa və Keçəl Novruz atributlarıdır. Keçəl qışı, Kosa isə yazı tərənnüm edir.

## Adətləri

Novruz bayramında aşağıdakı adətlər yerinə yetirilir:

Torba atmaq - Sonralar torba, xurcunla, papaqla əvəz olunub. Ancaq Azərbaycanda namus, qeyrət rəmzi olan papağın qapılara pay üçün atılmağı birmənalı qarşılanmır və tənqid edilir. Qapıya atılan torbanı boş qaytarmazlar.

Qulaq falına çıxmaq - Əgər gizlin dinlənən evdən xoş söhbət eşidilərsə, bu arzunun yerinə yetəcəyinə işarədir.

Tonqaldan tullanmaq - Tonqaldan tullarkən bu ifadə deyilir: "Ağırlığım - uğurluğum odda yansın".

Üzük falına baxmaq - Qızlar üzüyü saç telinə bərkidib su ilə dolu stəkanın üstündə saxlayarlar. Üzük stəkana neçə dəfə dəysə, bu həmin qızın o yaşda ərə gedəcəyinə işarədir.

Səməni göyərtmək - Bu yazın gəlişinə və bitkilərin oyanmasına işarədir.

Yumurta döyüşdürmək - Oyunun nəticəsində tərəflərdən biri digərinin tələblərini yerinə yetirir.

Qonaq getmə -. Novruzda qohumların və qonşuların evinə qonaq gedərlər, onlara Novruz payı apararlar.

Yaşlıları ziyarət etmək - Yaşlı və xəstə insanlar ziyarət olunar, bayramları təbrik edilər.

Şam yandırmaq - Novruzda ailənin sayı qədər şam yandırarlar.

Küsülülərin barışması - Novruzda heç kim küsülü qalmamalıdır, bütün küsülülər barışmalıdır.

Yallı getmək - Azərbaycan xalqının qədim dövrdən bəri ifa etdiyi rəqsdir. Bunun mənası insanların birliyidir.

Xoruz döyüşdürmək - Bunun üçün xüsusi döyüş xoruzları böyüdülür.

Novruzu qeyd edən hər bir xalq bu bayramla bağlı etnik, yerli, milli xüsusiyyətlərinə uyğun, özünəməxsus mövsum və mərasim nəğmələri yaratmışdır.

Novruz Azərbaycanla yanaşı İranda, Türkmənistanda, Tacikistanda, Özbəkistanda, Pakistanda, Qazaxıstanda, Qırğızıstanda xüsusi təntənə ilə qeyd edilir.

Adətə görə süfrəyə **"s"** hərfi ilə başlayan 7 növ ərzaq qoyulur: **Su, süd, sucuq, sünbül, səməni, siyənək balığı, süzmə.**

Novruz dünyanın əksər ölkələrində bu xalqların nümayəndələri tərəfindən geniş şəkildə qeyd edilir. Bu cür məkanlar arasında Los-Anceles, Toronto, Londonu gös-

tərmək olar olar.

Los-Anceles şəhərinin ocaq qalamağa dair sərt qərarları var, heç bir kəsə öz mülkündə ocaq qalamağa icazə verilmir. Buna baxmayaraq Cənubi Kaliforniyada yaşayan və Novruzu qeyd etmək istəyən azərbaycanlılar və iranlılar Kaliforniyanın çimərliklərinə gedir və ocaq qalamağa icazə verilmiş yerlərdə bayram ocağı qalayırlar.

**Novruz – İranda**

İranda süfrələrdə fərqli bir səməni olur və bu səməni ən çox mərcidən göyərdilir.

**Novruz - Əfqanıstanda**

Əfqan süfrəsi isə adətən stolun üstündə olmur. Süfrə yerə sərilir və ona dəstərxan deyirlər. Əfqan süfrəsində kompota bənzər bir təam da olur. Həmin təamın adı "həft meyvə", yəni yeddi meyvədir. Amma quru meyvələrdən hazırlanır. Əfqanlar bunu ilin heç bir ayrı ayında hazırlamırlar, ancaq Novruzda hazırlayırlar. "Həft meyvə" - ərik qurusu, kişmiş, qoz, iydə və sairdən hazırlanır.

Əfqanıstanda da Azərbaycandakı kimi yumurta döyüşdürmələri olur, amma orda yumurta boyamaq bir az uzun çəkir, yumurtaları qaynadandan sonra da fırçayla üstünə cürbəcür naxış vururlar.

Əfqanıstanda Novruz şənliklərinin mərkəzi "Məzari-şərif" şəhəridir. Əfqanların inancına görə, Məhəmməd peyğəmbərin (s) kürəkəni Həzrəti-Əlinin (ə) məzarı bu şəhərdədir. İnsanlar həmin şəhərə toplaşır, Əlinin ziyarətgahında orda xüsusi sərgilər, mərasimlər, şoular təşkil olunur. Novruzda "Məzari-şərif"də müxtəlif oyunlar, yarışmalar da olur. Bu yarışmaların mövsümü Novruzda başlayır. Sonra 3-4 ay davam edir. Çərpələng uçurtma və

bu kimi oyunlar da olur. Amma əfqanlar Novruzda "Məzari-şərif"ə təkcə şənlənməyə getmirlər. Əfqanlar Məzari-şərifə gedirlər, orda xüsusi bayraq qaldırırlar. Bayraq 10 gün orda qalır.

Sonsuz qadınlar Həzrəti-Əlinin (ə) ziyarətgahına gəlir, ora lentlər bağlayırlar, Allaha dua edirlər ki, Həzrəti-Əlinin (ə) xətrinə ailənin övlad arzusunu yerinə yetirsin.

**Novruz -Qırğızıstanda**

Qırğız süfrəsində məxsusi olaraq Novruzda bişirilən beşbarmaq olur. Bu quzu ətindən və makarona oxşar un məmulatından bişirilir. Əllə yeyildiyinə görə, bu yeməyə beşbarmaq deyilir.

**Novruz –Tacikistanda**

Tacikistanda isə Novruz martın 20-də başlayır, 3-4 gün davam edir. Uşaqlar yaz çiçəklərindən dərib yığır, qapıları döyür, ev sahibinə çiçəklərdən verir, ev sahibi də onlara ya konfet, ya yumurta, ya da pul verir.

**Novruz -Özbəkistanda**

Özbəkistanda Novruz süfrəsi üçün "nişala" hazırlayırlar. Nişala şəkərdən bişirilir - ağ şokolad kimi olur.

**"YARAN SUVAR" – ŞƏFƏQ BAYRAMI**

Novruzu bayram kimi çox əlvan keçirən xalqlardan biri də Qafqaz xalqlarıdır. Bu barədə tarixçi-publisist Dilbər Ağayevanın xalqın nümayəndəsi kimi verdiyi məlumatı mötəbər hesab etdiyimizdən həmin məqaləni kitaba daxil etdik. Bununla da Qafqaz xalqlarının da bu bayrama qatdığı təbiət rənglərini oxucuya təqdim etmiş olarıq:

"Novruz - fars sözü olub - Yeni gün deməkdir. Bu günü

bir çox xalqlar qeyd edir. Onun tarixi, harada, kim tərəfindən yaradıldığı bəlli deyil. Amma, bir çox atributlarını nəzərə alsaq hiss olunur ki, o özündə insanlığın bütün inkişaf mərhələlrinin izlərini birləşdirir. Zaman-zaman təkmilləşərək bu günə gəlib çatıb.

Mənə elə gəlir ki, Novruz Azərbaycanda hər yerdən daha əlvan keçir. Çünki, Azərbaycan bir çox millətlərin bir arada yaşadığı arealdır. Hər bir xalq öz milli adətini bayrama əlavə edir. Məsələn, Azərbaycanda yaşayan ləzgilər bu bayrama "Yaran suvar" (Şəfəq bayramı) deyirlər. Şəfəqlər qırmızı olduğu üçün əsasən qırmızı rəngə üstünlük verilir. Təsadüfi deyil ki, ləzgicə qırmızı rəngə də "yaru" deyirlər. Beləliklə, qırmızıların, şəfəqlərin və yeni günün - sabahların bayram edilməsidir bu.

Kəndirbazlar, pəhləvanlar, rəqqaslar, musiqiçilər xalq şousunun əlvan keçirilməsini təmin edir. Səməni cücərdib, şirniyyat bişirilir. Hər cür halva bişirmək, rəngli yumurta, bayramlaşmalar, tonqallar, falabaxmalar, qapıpusmalar, oyunlar, papaq atmalar və s.

Çərşənbələri qeyd etmək, əcdadların məzarlarını yad etmək, qəbr üstə getmək, ayinləri icra etmək…

Bir qədər səməni barədə: bu mənim subyektiv fikrimdir. Çörəyin kəşfi bəşərin taleyində ən böyük və dəyərli kəşflərdəndir. Bir növ həyatın mənbəyidir buğda dəni. Bu, dənin cücərməsi, həyatın davamına ümidin əminliklə əvəz olunmasıdır. Nə qədər ki, dən cücərəcək, yetişəcək və toplanacaq, emal olunacaq və çörək bişiriləcək həyat beləcə dövr edəcək. Müsəlman xalqları deyirlər ki, bu bizim bayramdır. Türk xalqları deyirlər ki, bu bizim bayramdır. Farslar da bunu deyir, Qafqaz xalqları da həmçinin. Məlumdur ki, Novruz islamdan əvvəl də keçirilirdi. Hədislərdə bildirilir ki, bir gün Həzrəti -Əliyə (ə) halva və

çörək verirlər. Soruşur ki, “bu nədir?” - deyirlər bu gün Novruz bayramıdır, bu da bayram sovqatıdır. Deməli, İslama qədər artıq onun atributları, ayinləri, bir bayram kimi təşkili bəlli idi və icra olunurdu. Farslar iddia edə bilərlər ki, «Novruz» fars sözüdür, adı üstündə bayram bizə məxsusdur. Bəlli olur ki, həmin bayramı cüzi fərqlərlə Qafqaz xalqları keçirir adına “Yar”(şəfəq) deyirlər. Demək bu ehtimal da aradan qaldırılır. Qafqaz xalqları həmin gün qırmızı geyimlərə üstünlük verib doğmaların anılmasına, sevginin aşıb-daşmasına şərait yaradırlar. Onların mifologiyasında Günəş baş Allah olduğundan isti, işıq, şəfəq, sevgi və yenilik mənbəyi kimi onu qəbul edirlər. Ocaq da, çıraq(çı rağ-bizim günəş) da onun şərəfinə yandırılır. Paylaşmaq ən vacib ritualdır. Kəndirbazların rəqsləri və pəhləvanların güləşməsi onların ən sevimli və qədim oyunlarıdır.

Novruzun həddən artıq əlvanlığının bir səbəbi də qədim tarixə malik olub, çox millətlərin milli adətlərini özündə birləşdirməsidir. Hamı üçün eyni olan nöqtə təbiət hadisəsidir: gecə ilə gündüzün bərabərləşməsi və günün bundan sonra uzanmasıdır. İsti və işıq çox olacaq. Yaz aratı və səpin sevinc gətirir. Yazın qış üzərində, xeyrin şər üzərində qələbəsi anı kimi bayram edilir. Sevinclərini hər kəs bacardığı kimi ifadə edir. Zamanla bu, bir ay davam edən bayram kimi formalaşdı.

Burada bir şeyi nəzərdən qaçırmaq olmaz ki, əsrlərlə davam edən adət-ənənəyə heç kim etiraz etməyib. Yalnız Sovet dövründə Novruz Bayramının keçirilməsinə qadağa tətbiq olundu. Bəlli olur ki, heç o da xalqın iradəsini qıra bilmədi. Şıxəli Qurbanov o bayramı bərpa etdi. Buna görə Azərbaycan xalqı o şəxsiyyəti məhəbbətlə yad edir”.

# AZƏRBAYCAN KİNO SƏNƏTİNDƏ NOVRUZ BAYRAMI

Yuxarıdakı yazılarımızdan birində Novruzun Azərbaycanın milli bayramı olması haqqında fikirlərimizdən bəhs etmişdik. Həqiqətən də Novruz Azərbaycan xalqı üçün o qədər əziz bayramdı ki, məişətimizin hər sahəsinə nüfuz edib. İncəsənətin böyük bir sahəsi olan kinomuzda da bu öz əksini tapıb. İradə Sarıyevanın bu barədə maraqlı bir araşdırmasına rast gəldik. Mütəxəssis fikri olması etibarı ilə həmin məqaləni mötəbər hesab etdik və onu bəzi ixtisarlarla kitaba daxil etməyi lazım bildik: “Azərbaycan mədəniyyətinin dövlətçiliyə xidmət etdiyi məlumdur. Minillərdən bəri formalaşan ənənələrə sadiqliyi, bu yöndə dəyərli nümunələrin ortada olması fikrimizi təsdiq edir. Azərbaycan kino sənətində Azərbaycanın milli adət-ənənələri, dövlətçiliyi, həyat tərzi özünü əks etdirir. Bu, Azərbaycan kinosunun sovet dövrünə düşən hissəsindən formalaşmağa başlayıb. Milli kino adamlarının ərsəyə gətirdiyi filmlərdə Azərbaycan xalqının etnoqrafik yaddaşı, mədəniyyəti, ənənələri, tarixi öz əksini tapıb. Təbii, buna geniş şəkildə yer verilməsə də, müxtəlif element və ştrixlərlə filmlərdə milli bayram ənənələrini ifadə edə biliblər. O illər Azərbaycan müstəqil deyildi, Sovetlər Birliyinin tərkibində yaşayırdı. Mədəniyyətimiz, kinomuz mütləq dəmir qapıları yarıb keçməli idi. Hər bir milli element olan film çək-çevirə salınır, onun ideoloji cəhətdən "qüsur"ları düzəldilərək ekranlara çıxarılırdı. Əslində, burada heç bir

qüsur yox idi. Milli düşüncəyə sahib kino adamları çalışırdılar ki, çəkilən filmlərdə Azərbaycan xalqının adət-ənənəsi, milli bayramları ilə bağlı hissələr, süjetlər də olsun. Çünki onlar bilirdi ki, xalqı olduğu kimi bütöv təqdim etməyin müsbət tərəfləri həddindən artıq çoxdur. Azərbaycan kinematoqrafları buna nail olublar. Azərbaycan xalqının tarixindən, mədəniyyətindən, etnoqrafiyasından, folklorundan, bayramlar ənənəsindən elementlər filmlərdə mövcuddur. Novruz-Yeni Gün bayramı da xalqımızın əsas milli bayramı kimi minillərdir qeyd edilir. Bu bayram Azərbaycanın Şimalında da, Cənubunda da, Dərbənddə də, Borçalıda da, Kərkükdə də böyük təmtəraqla qeyd edilir. Məlumdur ki, ekran əsərlərində Novruzun da təsviri verilib.

Bu bayramın taleyimizdə, həyatımızda xüsusi yeri var. Min illərin nəfəsini, ruhunu özündə yaşadan bu bayram hər il xüsusi təntənə ilə qeyd edilir. Novruz ruh yüksəkliyi, əmək coşqunluğu, torpağa, insana məhəbbəti ifadə edən böyük el bayramıdır. Kino sənətində Novruzla bağlı süjetlər çoxdur. Azərbaycan kino sənətində də Novruz mövzusuna bu və ya digər səviyyədə müraciət olunub. Ayrı-ayrı filmlərdə bu bayramla əlaqədar nüanslara toxunulub. Amma, bu filmlərin sayının azlığı onu sübut edir ki, biz milli bayramımızın bədii ekran təcəssümünə lazımi qədər nail ola bilməmişik. Bu məsələ ilə bağlı mütəxəssislərin fikirlərini öyrəndik. Kinoşünas, əməkdar incəsənət xadimi Aydın Kazımzadənin sözlərinə görə, bir sıra filmlərimizdə Novruzla bağlı epizodlara rast gəlmək olar: "Yazıçı İsmayıl Şıxlının eyni adlı romanı əsasında rejissor Hüseyn Seyidzadənin ekranlaşdırdığı "Dəli Kür" filmində Novruz bayramı ilə bağlı kadrlar var. Filmdə cavanların müəllimlərinə bayram payı gətirməsi, yumurta döyüşdür-

mə, uşaqların müxtəlif Novruz adətləri ilə bağlı oyunları, bacadan şal atmaları əksini tapıb".

Rejissoru xalq artisti Tofiq Tağızadə, ssenari müəllifi Yusif Səmədoğlu olan "Yeddi oğul istərəm" filmində də Novruzla bağlı epizodlar yer alıb. Kosa və Keçəlin oyun nümayiş etdirməsi, yeddi oğuldan birinin əlində səməni gəlməsi, camaatın bayrama hazırlaşması və s. burada öz əksini tapıb.

Digər film isə rejissor Fikrət Əliyevin İbrahim bəy Musabəyovun "Neft və milyonlar səltənətində" povestinin motivləri əsasında çəkdiyi "Qızıl uçurum" filmidir ki, burada da Novruzla bağlı epizod təsvir olunub".

Filmlərində milli adət-ənənələrə geniş yer verən kinorejissor, əməkdar incəsənət xadimi Fikrət Əliyev bildirdi ki, filmi çəkən insanın əqidəsi, mənəviyyatı və daxili dünyası necədirsə, bu onun filmlərində mütləq özünü büruzə verməlidir: "Bəlkə də bu səbəbdən çəkdiyim filmlərdə Novruz və digər adətlərimiz öz əksini tapıb".

"Azərfilm" kinostudiyasının baş direktoru, rejissor Fariz Əhmədovun da mövzu ilə bağlı fikirləri maraqlı oldu. Onun sözlərinə görə, kino həyatın ekrana köçürülmüş variantı olduğu üçün həyatda qarşılaşdığımız hadisələrlə ekranda da qarşılaşmaq mümkündür. Filmlərimizdə həyat tərzimizdə önəmli yer tutan, adət-ənənəmizi əks etdirən Novruz motivlərinə rast gəlmək mümkündür.

Müasir filmlərdən isə Asif Rüstəmovun "Ev" qısametrajlı filmində Novruzun səməni becərmək, tonqal yandırmaq və s. atributları ekran əsərinin ideya həllində sətiraltı yozumlarla özünəməxsus süjet xətti əmələ gətirib. Sənədli və televiziya filmlərimizdə də Novruz rituallarının əks olunduğu çoxsaylı nümunələrə rast gəlmək olar. "Yaddaş", "Salnamə", "Buta" və digər studiyalarda bu günə ki-

mi Novruzla bağlı bir çox sənədli filmlər lentə alınıb, xalqın bu qədim el bayramının mahiyyəti, ideyalar aləminə işıq tutulub. Novruz Şərq xalqlarının özünəməxsusluqlarından biri kimi digər xalqların və nüfuzlu beynəlxalq təşkilatların da diqqət mərkəzindədir. Məhz mütərəqqi ideyalarına görə 2009-cu ildə Novruz bayramı YUNESCO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilib, martın 21-i Beynəlxalq Novruz Günü kimi təsdiq olunub. Bu bayram dünyanın bir çox ölkələrində yaşayan həmvətənlərimiz tərəfindən yüksək təntənə ilə qeyd edilir, tanıdılır. Novruz bayramının mükəmməl ekran həlli aktuallığını qoruyub saxlamaqdadır. Milli və bəşəri dəyərlərin kompleks şəkildə birləşdiyi bu bayram baxımlı bədii filmlərin yaranması üçün mühüm mənbədir.

Azərbaycan Müəllimlər İnstitutunun Sumqayıt filialının əməkdaşı, professor, tarix elmləri doktoru Arif Məmmədovun qeydlərinə görə, Azərbaycanda Novruz şənliklərinin keçirilməsi haqqında fransız səyyahı Şardenin də qeydlərində məlumatlar var: “Hamının Novruzda təzə paltar geydiyini görən Avropa səyyahları Novruz bayramını həm də “Təzə paltar” bayramı adlandırırdılar.

Novruz adət-ənənələri ilə bağlı keçirilən mərasimlər xalq yazıçısı İsmayıl Şıxlının “Dəli Kür” romanında, S.Vurğunun “Komsomol” poemasında geniş təsvir edilir”. Qeyd edək ki, 1969-cu ildə tanınmış kinorejissor Hüseyn Seyidzadənin İsmayıl Şıxlının ssenarisi əsasında ekranlara gətirdiyi “Dəli Kür” filmində Novruz bayramı ilk dəfə ekrana təmtəraqla çıxarılıb. Ona qədər ekranlarda Novruz ənənələrinin görsənməsi bir növ yasaqlanıbmış. Azərbaycan kino sənətində Novruz elementlərinin olması o dövrdə insanlarda böyük ruh yüksəkliyi yaradır, onları milli bayramlarına bir daha bağlayırdı. Novruz ənənələrinin kino

sənətində təsvirini şərh edən Azərbaycanın görkəmli aktyoru və rejissoru Şeyx Əbdül Mahmudbəyov mətbuata bildirib ki, o ilk dəfə Novruzun təmtəraqlı təsvirinə "Dəli Kür" filmində rast gəlib":... Adil müəllimin kinostudiyaya gəlişilə bayram filmlərdə əks olunmağa başladı. İsmayıl Şıxlının əsərindəki Novruz bayramı Hüseyn Seyidzadəyə onları ekranlaşdırmaq üçün əsas verdi. Hüseyn müəllim də belə səhnələrin mahir qurucusu olaraq çox yüksək səviyyədə təşkil etdi. Həmin epizodu Dədəgünəş kəndində qurduq. Hər şey hazır olanda çəkilişlər başladı. O səhnənin çəkilişi isə 1 həftəyə baş tutdu. O çəkilişə 3 dəfə Adil müəllim o vaxtkı mədəniyyət naziri Məmməd Qurbanov, Mərkəzi Komitənin şöbə müdirlərilə gəlib tamaşa etdi. Siz təsəvvür edin ki, Moskvada o cür möhtəşəm filmin təhvili vaxtı Novruz bayramı səhnəsinə necə xüsusi maraq göstərildi. O qədər gözəl münasibət vardı ki, hamısı ağzını açıb təəccüblə tamaşa edirdi. Məhz bu filmdən sonra geniş, təmtəraqlı səhnələr çəkilməyə başladı. İlk dəfə papaqatdı, yumurta döyüşdürmə kimi ənənələrimiz filmdə təsvir olunmuşdu. Orda balaca uşaqla Çernyayevskinin dialoqu olan səhnədə uşaq deməli idi ki, "çünki bizdə papağı olmayan kişilərə pis baxırlar". Gördük ki, bu bir az "ağ" oldu. Məlum olduğu kimi, söhbət Çernyayevskidən gedirdi, hansı ki, Azərbaycana maarifləndirmə, xoş niyyətlə gəlmişdi. Elə buna görə də mətn dəyişdirilərək, uşaq "papaq pay qoymaq üçündür" dedi. O vaxt çox adam Novruz haqqında çox şeyi bilmirdi. Bildiyiniz kimi, bayram 4 çərşənbədən ibarətdir. Hər çərşənbənin öz mahiyyəti var. Biz o çərşənbələrin mahiyyətini açmağa çalışdıq. 4 çərşənbə həm də 4 fəslə işarədir. Bircə mənim indi bəyənmədiyim Keçəllə Kosadır. Görün Yeni ildə Şaxta baba nə gözəl işlər görür. Qar qızla birlikdə uşaqlara hədiyyə

paylayır. Amma bizim Keçəllə Kosa qapı-qapı gəzib pay "dilənir". Mən bunu qəbul etmirəm. O vaxt kinoda təsadüfi şeylər az olurdu. Çünki hər şey ciddi, peşəkar səviyyədə işlənib hazırlandıqdan sonra texniki tərəfi həyata keçirilirdi. İdeoloji təbliğat, aktyor oyunu baxımından heç bir əlavədən söhbət getmirdi". Əbdül Mahmudbəyov filmdə faytonçu Məmmədəlinin bayram haqda fikirlərinə dəyər verib: "Məmmədəlinin (aktyor İsmayıl Osmanlı) faytonu da real fayton idi. Teatrdan fərqli olaraq, kinoda hər şey göz qabağında olduğundan, reallıq qorunub saxlanmalı idi. Onu təhrif etmək, dəyişmək, tamaşaçını aldatmaq mümkün olan iş deyil. Həmin fayton indi də kinostudiyada durur. Bunun üçün bizim rəssamlar, dekoratorlar vardı. Faytonun hansı dövrə aid olmasını dəqiq öyrənərək eskizlərlə işləyib hazırlamışdılar. İndiyə qədər həmin faytona zarafatla "İsmayıl Osmanlı faytonu" deyirdik. O vaxt bir maşında, ya faytonda çəkiliş aparılırdısa, öncə onun içi göstərilməli idi. Ondan ötrü "lapet" deyilən bir şey vardı. Aktyorlar onun üstündə arabaya, maşına mindirilirdi. Əslində burda da belə olmuşdu. Araba böyük bir lapetin üstünə qoyulmuşdu. Hərəkət edən lapet idi, fayton isə yerində qalmışdı. Çünki orada həm faytonun böyük planlı çəkilişi vardı, həm də Məmmədəli ilə Çernyayevskinin Novruz bayramı barədə söhbəti. Qonaq deyir ki, “niyə belə tələsirsən?”. Məmmədəli cavab verir ki, “bizdə bayram axşamında adət belədir ki, gərək hamı evdə olsun”. Çəkilişlər əsasən yaz-yay fəslində həyata keçirilmişdi. Öncə burdakı çəkilişləri kənara qoyub Çuxuryurdda çəkiləcək səhnələri reallaşdırmaq üçün 2 ay sərf etməli olduq".

Novruzun geniş təsvirini tapdığı filmlərdən biri də xalq şairi Səməd Vurğunun “Komsomol” poemasının motivləri

əsasında Azərbaycanda sovet hakimiyyətinin qurulmasının 50 illiyinə həsr edilən "Yeddi oğul istərəm" filmi olub. Görkəmli kinorejissor Tofiq Tağızadənin Yusif Səmədoğlunun ssenarisi əsasında 1970-ci ildə çəkdiyi filmdə Novruz olduğu kimi təsvir edilib. Burada meydan oyunlarının dəqiq verilməsi, bayramın olduğu kimi təsviri maraq doğurur. Filmdə bayram təsviri meydan oyunları ilə verilir. Kənddə Novruz bayramıdır və Kosa və Keçəlin müşayiəti ilə kənd əhli şənlik edir. Toy-düyün sədaları altında bayram edən kütlə, kənd camaatı bayramı qeyd edir.

A kosa-kosa gəlsənə,
Gəlib salam versənə.
Çömçəni doldursana,
Kosanı yola salsana.
Ay uyruğu uyruğu,
Saqqalı it quyruğu.
Kosam bir oyun eylər,
Quzunu qoyun eylər.
Yığar bayram xonçasın,
Keçəlin toyun eylər...

Bu cür maraqlı bayram əhvalı təsvir edilən filmdə şənlik Gəray bəyin yaratdığı faciə ilə sona yetir. Bayramın gur yerində bir kənd qadını "ay camaat, Gəray bəy al bayramımızı qara elədi"-deyir. Azərbaycan kino sənətində Novruz bayramının daha ətraflı, öz mahiyyətinə uyğun şəkildə təsvir edilməsinə böyük ehtiyac var. Düşünürük ki, bayramın təqdim edilməsi, təbliği üçün çəkilən filmlər azdır, yeni filmlərdə də Novruz bayramı çəkilməlidir.

# NOVRUZ BAYRAMI RƏVAYƏTLƏRİN DİLİ İLƏ

## Şah Abbas və 3 kasıb

Deyirlər ki, Novruza üç gün qalmış Şah Abbas təğyirlibas oub, köhnə-kürüş paltar geyinib çıxır el içinə ki, rəiyyətin günündən, güzəranından, yeni ilə necə hazırlaşdığından xəbər tutsun. Bir bağçadan keçəndə qəfildən öz aralarında pul bölüşən üç nəfərin üstünə çıxır. Bunlara məhəl qoymayıb uzaqlaşmaq istəyirdi ki, bu adamlar onu saxlayırlar, deyirlər ki, üst-başından görünür ki, elə sən də bizim kökdəsən, üst-baş cırıq, dabanı yırtıqsan. Bax, bayaq yoldan kedirdik, götür-qoy edirdik ki, neyləyək, nə çarə eləyək, Novruza bir şey qalmayıb, bayram qapını kəsəcəcək. Elə bu dəmdə yolnan gedirdik, bu pulu tapdıq. Görünür, Allah bizi ümidsiz qoymadı ki, Novruzda peşman olmayaq. Elə pulu təzəcə bölüşürdük ki, sən gəlib çıxdın. Deməli, qismətində varmış, gəl dördümüzün arasında bölüşək.

Şah Abbas bunların təmiz qəlbinə ürəyində "əhsən" deyir, istəyir bir yaxşılıq eləyə bu adamlara. Deyir, gəlsəniz dördümüz də bir iş görək. Bu pulnan nə novruzluq, heç yumurta pulu da deyil. Üç dostun üçü də başını qaşıyır və soruşurlar: "Nə iş?" Şah Abbas öz xəzinəsinin gizli yolu olduğunu onlara başa salır. Bunlar da nə bilsinlər ki, iş nə yerdədir, bu adam kimdir. Razılaşırlar. Yolda Şah Abbas soruşur ki, kimin əlindən nə gəlir? Bunlardan biri qayıdır ki, mən bütün heyvanların dilini bilirəm. O bi-

ri də deyir ki, məndə də elə bir hikmət var ki, hansı qapıya bir göz ucu ilə baxsam açılasıdır. Üçüncü də deyir ki, gündüz heç, gecənin gözgörməz qatı qaranlığında bir adamın üzünə bircə kərə baxmağım kifayətdir ki, əlli ildən sonra da onu görsəm tanıyaram. Sonra bu üç nəfər Şah Abbasdan soruşur ki, bəs sənin əlindən nə gəlir? Şah qayıdır ki, mən əlimi bircə kərə sağ bığıma çəksəm yan-yörəmdə nə qədər adam varsa bir də göz açıb görərlər ki, zindana təpiniblər. Yox əgər əlimi sol bığıma çəksəm, zindanda nə qədər məhbus var, azadlığa çıxasıdır. Bu üç nəfər şübhə ilə Şah Abbasın bığına göz qoyurlar...

Nə isə, beləcə söhbət eləyə-eləyə gəlib yetişirlər şəhərə. Elə birinci küçəyə ayaq qoycağın yoldan ötən bir köpək başlayır bunlara hürməyə. Şah heyvanların dilindən xəbərdar olandan soruşur ki, de görək, o köpək nə demək istəyir. Heyvan dili bilən qayıdır ki, it keşikçiləri duyuq salmaq istəyir ki, ehtiyat olun, şəhərdə oğru var.

Xeyli yol gedirlər. Gəlib çıxırlar xəzinənin gizli qapısı ağzına. Qapı da nə qapı! Top vursan dağılmaz!

Şah bağlı qapıları göz ucu ilə açan adama deyir: "Hə, göstər məharətini görək". O da gözünə döndüyüm bircə baxışı ilə qapıları taybatay açır. İçəri soxulub o ki, var qızıldan, gümüşdən yüklərini tuturlar. İşləri görüb dağılışmaq istəyəndə Şah Abbas bunların yaşadıqları yerləri xəbər alır ki, bir də iş görmək lazım gələndə tapışa bilsinlər. Bunlar da nə bilsinlər ki, iş nə yerdədir. Hərə öz yerini-yurdunu nişan verir. Beləcə dağılışırlar. Səhərisi şəhərə hay düşür ki, bəs şahın xəzinəsini yarıblar. Şah bunu eşitcəyin qırmızı geyinib taxta çıxır, əmr eləyir ki, filan yerdə, filan ünvanda olan filankəsləri tez tapıb hüzuruma gətirin. Öz-özünə götür-qoy edir ki, görən bu adamlar ki, bu qədər qəlbi təmiz, arif və səxavətlidirlər, dar ayaqda necə, bir-

birini satıb eləməzlər ki? Həm də üçüncü adamın fəhmini imtahana çəkmək istəyir ki, görən dünən gecənin zülmətində səfil sərgərdan kökündə görən həmin adam bu dəbdəbəylə onu tanıyacaqmı?

Bəli, həmin adamları bir su içimlikdə şahın hüzuruna gətirirlər. Şah əvvəlcə heyvan dilini biləni xəlvətcə dindirir, deyir bəs filan yerdə yaşayan dostun bizə xəbər gətirib ki, sən xəzinəni yarmısan. Heyvanların dilini bilən ağzına nə sayaq su alıb durursa, şah Abbas ondan bir söz qopara bilmir. Sonra bir göz ucu ilə qapıları açanı dindirir. O da iki ayağını bir başmağa dirəyir ki, onu kim deyirsə qələt eləyir. Heç mən bir aydır ki, şəhər üzü görmürəm. Axırda şah üçüncü adamı çağırtdırır. O gəlməmiş üz-gözünü, görkəmini, səsini tamamilə dəyişir. Şah nə illət eləyirsə kişinin cınqırığı da çıxmır. Eləcə dayanıb zəndlə Şah Abbasa baxır. Axırda şahın təbdən çıxdığını görüb deyir: “Şah sağ olsun, daha əsib-coşmağın nə mənası. Əlinizi elə bircə kərə sağ bığınıza çəkin, məsələ xətm olunsun da!

Şah Abbas elə bu yerdə bir qəhqəhə çəkir ki, şüşələr cingildəyir, az qala qopub yerə tökülsün. Hər üçünü də hüzuruna gətirib bu mərdliklərinin əvəzində onlara o ki, var bayram bəxşeyişi verib yola salır.

## NOVRUZ BAYRAMI DİNİ MƏNBƏLƏRDƏ

Novruz bayramı Allahın bəndələrinə bir lütfüdür. Dahi Azərbaycan şairi Məhəmməd Füzuli yazır:

Hər gün açılır könlümü zövqü-vüsalın yengidən,
Gərçi güllər açmağa hər ildə bir Novruz olur.

Novruz nə vaxtdan keçirilir, onu kim yaradıb, necə olub yaranab, atributların mənbəyi haradandır, bunları kim belə bölüb? Bu və digər bir çox suallara cavab üçün ən mötəbər mənbə həmişə olduğu kimi Qurani-Kərimdir. “Bəqərə” surəsinin 243-cü ayəsində buyurur: “Ya Məhəmməd minlərlə insanın taundan qorxub səhraya qaçdığını görmədinmi? Allah onlara “Ölün” dedi. Onların hamısı öldü. Sonra Allah lütv edərək onları diriltdi. Həmin hadisə Novruz bayramına təsadüf etdi”. Bu hadisə bir çoxları üçün bir ibrət olmalı idi. Amma, çoxları şükr etməzlər.

İmam Məhəmməd Baqir (ə) və İmam Sadiqdən (ə) mötəbər bir hədisdə hadisə belə söylənir: İraqın Əl-Vasif şəhərindən (hazırda bu şəhər Kufə şəhəri ilə Bəsrə arasında yerləşir) 70 000-dən çox insan taun qorxusundan səhraya qaçdılar. Allah-təala buyurdu: “Ölün”. Onlar bir saatın içində məhv oldular. Üstündən uzun bir müddət keçdi. Onların ətləri, sümükləri çürüyüb torpağa qarışdı. Minlərlə insanın cəsədi yerdə qalmış, heç kəs oraya yaxın getməmişdi. Bir gün Allahın nəbilərindən olan Hizgil peyğəmbər (ə) oradan keçirdi. Ölənlərin cəsədlərini görüb

Allaha dua edərək dedi: İlahi, sən onları öldürdüyün kimi diriltməyə də qadirsən.Mən arzu edirəm və istəyirəm ki, sənin şəhərlərini abad etsinlər və sənə itaət edəcək bəndələr dünyaya gətirsinlər deyə onları bir daha diriləsən. Allahdan vəhy gəldi: “Onların üzərinə su səp və dua elə”.

Ayədə də belə buyurur: “Fəbu hudahi miktadih” - peyğəmbərlərin doğru yoluna tabe olun. Su səpməkdə bir dirçəliş, bir həyat mənbəyi var. Su səpmək dünyanın bir çox xalqlarında var. Xristianlar da körpənin üzünə “müqəddəs” su səpirlər, gedənin arxasınca da su atırlar. Allahtəala Quranda buyurur: “Va caənnə minəl ma kullə şeyin” - biz hər şeyi sudan diriltdik”.

Su səpməyin hikməti var. Allah Hizgil peyğəmbərə (ə) çürümüş sümüklərin üzərinə su səpdirməsi bu hikmətə bağlıdı: onlar dirildi və bir birinə baxıb “Subhanallah” dedilər. “Allahu əkbər. La iləhə iləllah”. Hizgil peyğəmbər (ə) “Mən şəhadət verirəm ki, Allah hər şeyə qadirdir” dedi, Bundan sonra həmin insanlar uzun illər yaşadılar.

“Bəqərə” surəsinin 243-cu ayəsinin təfsirinə dair Əlləmə Təbatəbainin “Əl Mizan”, Cəlaləddin Siyutinin “Əddürrul Mənsur”, Fəxrəddin Razinin “Məfatihul qeyb” əsərlərinə baxmaq olar.

İmam Sadiq(ə) buyurmuşdur: “Minlərlə insanlar Novruz günü dirilmişlər. Həmin gün Günəşin yerə ilk saçdığı gündür”. Bu artıq odun suya toxunduğu andır. Bunun nəticəsində yaşıllaşma - həyat mənbəyi yaranır. Firon Musadan (ə) üzləşmə üçün vaxt və yer tələb edir. Onlara elə gəlir ki, Musa (ə) sehr göstərib misirliləri yerlərindən qovmaq istəyir. Buna görə dedilər: “Biz sənə eynilə sənin bizə göstərdiyin kimi sehr göstərəcəyik”. Musa (ə) bildirir ki, Zinət günü, günorta - insanlar meydana yığışanda gəlin”

(“Taha” 57,58,59).

Quranda “Zinət günü” - yəni özünə bəzək vurma, bəzənmə günündən bəhs edilmişdir. Zəməxşəri “Əl Kəşşaf” əsərində “Bu günə ona görə zinət günü deyilir ki, həmin gün onlar təzə və gözəl geyinir, özlərinə yaraşıq verir və bayram edirdilər” yazır və həmin günün Allahın qüdrətinin göründüyü günün Novruz bayramına təsadüf etdiyini bildirir. Məhz, Musanın (ə) Firona qalib gəldiyi gün Novruz günü idi.

Əllamə Təbatəbai “Əl Mizan” əsərində yazır ki, Musa (ə) ona görə həmin günü vədə verdi ki, o gün bayram günüdür və insanlar günorta bir yerə toplaşır və görüşüb söhbətləşirlər. Musa (ə) istədi ki, bunu hamı görsün.

İmam Əlinin (ə) “Əmirəl-möminin” seçildiyi gün Novruz günü olmuşdur. Bu səbəbdən xalq arasında Novruz bayramı “Cənab-Əli bayramıdır” sözünü işlədirlər. Bunu müxtəlif mənbələr təsdiq edir. Məsələn, Beyhəqi “Əfsunəqil-Kubra”, Xətib Bağdadi “Əttəbəqatüs səniyyə”, Cəlaləddin Siyuti “Cəmiul əhadis”, Məhəmməd ibn İbrahim Cəfi “Ət-Tarixul Kəbir” kitabında belə nəql edir: Novruz bayramı günü Əli Əbutalib oğlu - yəni Həzrəti Əliyə (ə) camın içərisində halva hədiyyə edirlər. İmam soruşur ki, bu nədir. Deyirlər ki, “Ya Əmirəl-möminin, bu gün Novruzdur, bu da Novruz hədiyyəsidir”. İmam deyir: “Hər gününüzü Novruz edin”.

Bilirik ki, bu hadisə Zilhiccə ayında baş vermişdir. Necə ola bilər ki, Novruzla Zilhiccə ayı üst-üstə düşsün. Həmin hadisə Peyğəmbər (s) axırıncı Həcc ziyarətindən qayıdarkən “Qədir-Xum” səhrasında baş vermişdir. O vaxt Zilhiccə dövr edərək bahara düşmüşdür. Bu səbəbdən Novruz gününə düşmüşdür. Necə ki, məhərrəmlik bəzən payıza, bəzən qışa, bəzən yaya düşür.

Novruz bayramı Azərbaycan, İran və Orta Asiyada qeyd olunan milli bayramdır. Novruzda insanlar təmizlik işləri görür, yaxınlarının və xəstələrinin görüşünə gedir, bir-birinə hədiyyə verir, küsülülər barışır, yeni paltarlar geyinirlər. Bir çox gözəl insani xüsusiyyətlər bu bayramda öz əksini tapır. Bu gözəl xüsisiyyətlər dinimizdə də bəyənilmiş sifətlərdəndir və bu haqda məsumlarımızdan (ə) çoxlu hədis nəql olunmuşdur. İmam Zeynəlabidin (ə) buyurmuşdur: "Namazdan sonra ən üstün əməl mömini sevindirməkdir" ("Biharul-ənvar", 4/194).

İmam Baqir (ə) buyurmuşdur: "İnsanın qardaşının üzünə təbəssümü və onun çətinliyini həll etməsi gözəl əməldir. Allah yanında mömini sevindirməkdən gözəl əməl yoxdur" ("Biharul-ənvar", 71/288).

İmam Sadiq (ə) buyurmuşdur: "Musa peyğəmbər (ə) Allah-taalaya dedi: "İlahi! məni xəstənin görüşünə getməyin savabından agah et". Allah-taala buyurdu: "Onu anadan olduğu kimi günahsız edirəm. Bir mələkə tapşırıram ki, qiyamət gününə qədər onu ziyarət etsin". (İrşadul-qulub, 1/108).

Peyğəmbər (s) buyurub: "İnsanın namazdan, küsülüləri barışdırmaqdan və gözəl əxlaqdan üstün əməli yoxdur" ("Cəvamiul-kəlim", səh, 698). Peyğəmbər (s) yenə də buyurub: "Küsülüləri barışdırmaq bütün namazlardan və oruclardan üstündür" ("Biharul-ənvar", 73/43).

Novruz bayramının adət-ənənələrində bu qədər gözəl İslami əxlaqlar olduğu üçün onun haqqında çoxlu hədislər buyurulmuşdur. Hədislərimizdə Novruz bayramı dini rəhbərlər tərəfindən təsdiqlənmiş və onun keçirilməsi lazım bilinmişdir. Hətta, Novruz bayramı üçün bir sıra ibadətlər də qeyd olunmuşdur.

İmam Cəfəri Sadiqin (ə) yaxın səhabəsi olan Müəlla ibn Xüneys rəvayət edir ki, Novruz günü İmam Cəfəri Sadiqin (ə) yanına getmişdim. İmam (ə) məndən soruşdu: "Sən bilirsən bu gün hansı gündür?" Dedim: "Sənə fəda olum, elə bir gündür ki, əcəmlər bunu bayram edərlər və bir-birlərinə hədiyyə, töfhələr göndərərlər". İmam (ə) buyurdu: "Bu təkcə bir-birlərinə hədiyyə göndərmək deyil. İstəyirsən ki, "Novruz bayramı"nın əsl fəzilətlərini sənə izah edim?" Dedim: "Ey mənim ağam, bu fəzilətləri bilmək mənim üçün ölənlərimin dirilməsindən və düşmənlərimin ölməsindən daha yaxşıdır. İmam (ə) buyurdu: "Ey Müəlla, doğrusu, Novruz bir gündür ki, Allah-təala bu gündə ruhlarla əhd-peyman bağladı ki, onun birliyinə pərəstiş etsinlər, ona şərik qərar verməsinlər. Onun Peyğəmbərlərinə (s) və İmamlarına (ə) iman gətirsinlər. Bu əvvəl gündür ki, günəş tülu etdi. Küləklər ağacları tozlandırdı. Güllər və çiçəklər yerdə yarandılar. Bu gün Nuh peyğəmbərin (ə) gəmisi tufandan sonra Cudi dağında dayandı. Bu o gündür ki, Allah-təala neçə min insana həyat bəxş elədi ki, onlar taun xəstəliyinin qorxusundan ölümdən qaçırdılar. Bir dəfəyə Allah onları öldürdü. Bir müddətdən sonra onların bədənlərinin sümükləri qalmışdı. Allahın Xirqil (ə) adlı Peyğəmbəri o sümüklərin yanından keçəndə Yaradandan sual etdi ki, "Bu sümükləri necə dirildəcəksən?" Allah ona vəhy etdi ki, "Dəstəmaz alıb, suyunu sümüklərin üstünə töksün". Peyğəmbər (ə) o cür də etdi. Bütün sümüklərin sahibləri Allahın qüdrətiylə dirildilər. Bu səbəbə görə, bir-birinin üstünə su çiləmək və ya insanın öz üzərinə su çiləməyi və qüsul etmək Novruz günündə savabdır. Hikməti dirilik və həyat sayılır. Bu qissəyə Qurani-Məciddə işarə vardır: "Ələm tərə iləlləzinə xərəcu min diyarihim və hum ülufun həzərəl mövt. Fə qalə ləhumullahu mutu süm-

mə əhyahum". Tərcüməsi: Minlərlə adam olduqları halda ölüm qorxusundan yurdlarından çıxanları görmədinmi? Allah onlara : "Ölün!" - dedi. Sonra isə onları diriltdi" ("Bəqərə" 243).

Bu Novruz günündə Cəbrail adlı mələk Peyğəmbərə (s) vəhy gətirdi. Yəni, "Məbəs" günü, 27 Rəcəb həmin gün idi. Və bu gündə Peyğəmbərimiz (s) Qüreyşilərin Məkkədə bütlərini sındırdı. Və Həzrəti-İbrahim (ə) o gün kafirlərin bütlərini sındırdı. Həmin gün Peyğəmbərimiz Həzrəti-Əliyə (ə) buyurdu: "Mənim çiyinlərimə çıx və kafirlərin bütlərini sındırıb yerə tök". Novruz günü Peyğəmbər (s) səhabələrə əmr etdi ki, Həzrət Əliyə (ə) beyət edin və deyin ki, "Ya Əli, sən bizim əmirimiz, rəhbərimiz və mövlamızsan". Yəni, "Qədir-Xum" günü də Novruza təsadüf etmişdir. Peyğəmbər (ə) Həzrəti-Əlini (ə) cinlər vadisinə bu gündə göndərmişdi. Osmanın ölümündən sonra xəlifəlik haqqı Həzrəti-Əliyə (ə) qaytarıldı. Novruz günü Həzrəti-Əli (ə) Nəhrivan müharibəsində qalib gəldi. Novruz günündə 12-ci imamımız Həzrəti-Qaim (əc.f) zühur edəcək və zülmə qalib gələcək. Biz Novruzun fərəc intizarını çəkirik. Bu gün bizim və şiələrimizin günüdür. Bu günə əcəmlər hörmət və ehtiram edirlər. Amma siz ərəblər onu zay edirsiniz". İmam Cəfər Sadiqin (ə) bu mübarək kəlamlarından sonra "Novruz bayramı" münasibətilə mərhum xanəndə, gözəl Fizulişünas Hacıbaba Hüseynovun baharın gəlişini tərrənnüm edən qəzəlini burada qeyd etmək yerinə düşər:

Tamaşa eylə, ey könlüm, bu aləm gör nə aləmdir,
Bahar əyyamı gəlmişdir, səfası canə məlhəmdir.

Gecə gündüzlə tənlənmiş, bu gündən eydi-Novruzdu,
Sular torpağa can vermiş, vüsali-abi-Zəmzəmdir.

Açılmış qönçələr bir-bir, çəmənlər laləzar olmuş,
Nəvayi-şurişi-bülbül, mənim şurimlə toəmdir.

Şərabi- biğəşin camın, mənə lütv eylə, ey saqi,
Bütün istəklərim səndən o camın içrə bir cəmdir.

Mənim dil verdiyim dilbər didaralar dilarası,
Deyərsən bir mələkdir bu, deməzsən nəsl adəmdir.

Olaydı qismətim ya Rəbb, duteydim damənin yarın,
Deyəydim dilbəra, səndə bu nazü, bu nə çəm-xəmdir?

Cəfayi -hicri yar ilə mənim də qəmlərim vardır,
Xəlayiq bilməyir ancaq, deyirlər Hacı biqəmdir.

Diqqət yetirilməli məsələlərdən biri bundan ibarətdir: Novruz ənənələrinin İslamla ziddiyyət təşkil etmədiyi barədə yuxarıda deyilənlərin səbəbi budur ki, bu ənənələri bu gün şirk səviyyəsində qəbul edən adama demək olar ki, rast gəlmirik. Tonqalı müqəddəs sayaraq onun üzərindən atılan, tonqal qalamağın uğur və xoşbəxtlik baxımından növbəti ilə təsir edəcəyini düşünən, əgər tonqalın üstündən atılmazsa, xoşbəxt olmayacağına inanan şəxs açıq-aşkar şirk etmiş olar. Amma buna sadəcə əyləncə, bayram atributu kimi yanaşmaq şirk sayıla bilməz. Eynilə də bayram ənənələrindən İslamla qəti uzlaşmayanlardan uzaq olmaq lazımdır. Məsələn, qəbir üstə gedərkən ora yeməli nəsə aparıb qoymaq, bəzi regionlarda ənənə olan gecə çölə su qoyub, səhər o suyu öz üstünə tökmək və bunun bərəkət

gətirəcəyinə inanmaq İslamla ziddir, bunların heç bir əhəmiyyəti yoxdur və bunlara inanmaq şirkə səbəb ola bilər. Qəbir ziyarət edib ölümü düşünmək, ölünün ruhuna rəhmət oxumaq isə əlbəttə, savabdır. Amma qeyd etdiyimiz kimi, tarixin müəyyən dövrlərində Novruz bayramı zərdüştilik dininə xeyli uyğunlaşdırılmış və atəşpərəst bayramı kimi tanınmışdı. İslam mənbələrində ara-sıra rast gəlinən və Novruza qarşı mənfi əhvali-ruhiyyə ilə köklənən hədislərin səbəbi də budur. Qeyd edək ki, son dövrlərdə bəzi nüfuzlu ruhanilərin Novruz bayramı və çərşənbə axşamları əleyhinə verdikləri bəyanatların kökündə də bu kimi məsələlər durur. Çünki həmin bəyanat və fətvalarla tanış olan zaman görürük ki, bunlarda Novruz ənənələrinin ləğvi deyil, mövhumat və xürafatlardan təmizlənməsi tələbi qoyulur. Fətvalarda deyilir ki, hər kim həqiqətən alovun ona xeyir gətirəcəyinə, tonqal üzərindən atılmaqla ziyandan qurtulacağına və növbəti ildə fəlakətlərdən amanda qalacağına inansa, bu əqidə şirk kimi dəyərləndirilir. Həmçinin, el şənliklərində fişəng və sairə bu kimi vasitələrə külli miqdarda vəsait xərcləmək də həm israfdır, həm də təhlükəsizlik baxımından zərərdir (çünki bu zaman xeylı bədbəxt hadisələr, fiziki xəsarətlər, yanğınlar baş verir). Amma bu fətvalarda sevinməyin, şadlıq etməyin, səliqə-səhman, təmizlik, sileyi-rəhim, sədəqə kimi əməlləri yerinə yetirməyin heç bir günahı olmadığı, əksinə, savab olduğu bildirilir. Novruz uşaqların sevincinə səbəb olan bir bayramdır. Keçəl və Kosa kimi personajlara, kəndirbazlara, el pəhləvanlarına tamaşa etmək, yumurta döyüşdürmək, tonqal üzərindən atılmaq uşaqlara xüsusi zövq verir. Buna görə də uşaqları bu sevincdən məhrum etməyə haqqımız yoxdur.

***

"Bilin ki, həqiqətən Allah yeri ölümündən sonra dirildir (onun inkişaf qabiliyyəti olan maddələrinə bir müddət sonra bitki həyatı bəxş edir. Buna görə sərt qəlblərə də iman suyu ilə həyat verəcəkdir). Həqiqətən Biz bəlkə düşündünüz deyə, (Özümüzün tovhid və əzəmət) nişanələri(mizi) sizin üçün aydınlaşdırdıq" ("Hədid"- 17).

Əlamətdar günləri qeyd edərək bayram etmək çox bəyənilən işdir. Necə ki, İsa peyğəmbərin(ə) dostları o həzrətdən istədilər ki, Allah-taala göydən onlar üçün hazır yemək göndərsin.

Bu barədə Qurani-Kərim "Maidə" surəsinin 114-cü ayəsində buyurulur: "Məryəmin oğlu İsa dedi: Allahım, bizim üçün göydən hazır yemək göndər, təki bu bizim əvvəlincimiz və sonuncumuz üçün həm Bayram olsun, həm də Sənin tərəfindən nişanə və möcüzə olsun. Və bizə ruzi ver ki, Sən ruzi verənlərin ən yaxşısısan".

Deməli yaxşı və əlamətdar günləri qeyd etmək ilahi sünnətlərdəndir. Həmçinin tarixi nəqllərə əsasən, Aişənin iki (başqa millətdən olan) kənizi vardı. Günlərin birində bu iki kəniz çalıb oynayırdılar. Əbubəkr bunu görüb onları şeytan adlandırdı və şənlənmələrinə mane oldu. Amma Həzrəti-Mühəmməd (s) onlara şənlənməyə icazə verərək buyurdu: "Hər xalqın öz bayramları var, bu da onların bayramıdır" (Umdətul Qari 6-cı cild 268-ci səhifə (müəllif əl-Ayni).

Hədislərə əsasən Novruz günü tarixdə bir çox əlamətdar hadisələr baş vermişdir. O cümlədən:

1) Dünyanın yaranması
2) Adəmin yaranması
3) Günəşin saçmağa, küləklərin əsməyə, ağacların və gül-çiçəklərin bitməyə başlaması

4) Nuh peyğəmbərin gəmisinin Cudi dagında aramlıq tapması

5) Ölümün qorxusundan evlərindən qaçarkən yolda ölmüş minlərlə insanın Allahın əmri ilə yenidən dirilməsi

6) İbrahim peyğəmbərin (ə) bütləri sındırması

7) Həzrət Mühəmmədin (s) İmam Əlini (ə) "Qədir-Xum" günü Vəsi (özündən sonrakı Rəhbər) təyin etməsi

8) 12-ci İmam Həzrəti- Mehdi (ə c.f) zühur edəcəyi gün ("Biharul- ənvar" 56 cild, səh. 93).

Novruz bayramının çoxlu adət-ənənəri vardır. Həmin adət-ənənlərindən biri də insanların bir-birləri ilə görüşməsi və bir-birlərinə hədiyyə verməsidir. Bu məsələni sevimli Peyğəmbərimiz (s) də hamıya xatırladır. Həzrəti-Mühəmməd (s) buyurur: "Bacardığınız qədər hər gününüzü novruz edin, yəni Allah yolunda bir-birinizə hədiiyə verin və bir-birinizlə görüşün" ("Dəaimul İslam" 2-ci cild, səh. 326).

Həmçinin başqa bir hədisdə oxuyuruq: "İbrahim Kərəxi deyir: İmam Cəfər Sadiqdən (ə) soruşdum ki, bir nəfərin tarlası var. Mehrəqan ya Novruz günündə ona hədiyyələr verirlər, o bu hədiyyələri onlardan götürsünmü? İmam(ə) buyurdu: Onlar namaz qılandırlarmı? Dedim: Bəli. İmam (ə) buyurdu: Gərək onların hədiyyəsini alsın və əvəzini versin. Həqiqətən Həzrət Muhəmməd ( s) buyurub: Əgər mənə müsəlman olan şəxslər bir keçi budu gətirsələr mən onu qəbul edərəm, çünki bu dindarlıqdandır. Amma əgər Kafir və ya Münafiqlər inək ya qoyun budunu mənə versələr qəbul etmərəm, çünki bu dindarlıqdandır. Allah Müşrik və münafiqlərin yeməklərini bizə rəva görmür" ("Əl-Kafi" 5.cild səh.142). Başqa bir hədisdə oxuyuruq: "Əmirəlmöminin Əliyə (ə) Novruz bayramında hədiyyə gətirdilər. İmam(ə) buyurdu: "Bu nədir belə?" Dedilər:

"Ey Əmirəlmöminin, bu gün Novruz günüdür". İmam(ə) buyurdu: "Hər günü Novruz edin. Bizim hər günümüz novruzdur"("Mən la yəhzurəhul fəqih" c.3. səh.300). Yəni, Noruz bayramının gözəl adət və ənənələrini həmişə canlı qoruyub saxlayın.

Novruz şərəfli və böyük gündür. Bu gündə arzular, dualar, istəklər Allah taala tərəfindən qəbul olunur.

Mühəddis Nuri "Mustədrəkul-Vəsail" kitabında Müfəzzəl ibn Ömərin İmam Cəfər Sadiqdən (ə) belə nəql etdiyini yazır: "Allah Həzrət Həzqil peyğəmbərə (ə) belə vəhy etdi: Ey Həzqil! Bu gün Mənim yanımda çox şərəfli və böyük gündür. Özümlə əhd etmişəm ki, hansı mömin bu gündə məndən hacət və arzusunu istəsə, Mən onun hacətini qəbul edərəm, həmin bu gün Novruz günüdür" ("Mustədrəkul Vəsail" c. 6 səh.354).

İmam Sadiq (ə) buyurub: Novruz o, gündür ki, Peyğəmbər (s) bu günü Həzrəti-Əlinin (ə) vilayəti üçün camaatdan peyman alıb, Novruz o gündür ki, Həzrəti-Əli (ə) Nəhrivan döyüşündə qələbə çalıb, Novruz o gündür ki: Bizim Qaimimiz (Imam Məhdi) o, günü zühur edəcək. ("Vəsailuş-Şiə" cild. 12. Səh. 214).

Novruz bayramı günü Peyğəmbər (s) Həzrəti-Əliyə (ə) buyurdu: "Ya Əli mübarək ayağını çiynimə qoy və Kəbə Evinin üstündə olan Qüreyşin bütlərini sındır". Həzrəti-Əli (ə) əmrə itaət edib (ə) bütləri sındırdı. Abbasqulu Ağa Bakıxanov Qüdsi yazır:

Belə bir rəmz var: Kəbədə büt qırmaq üçün,
Müstəfa çiyni Əli payinə minbər oldu.
O adam ki, bu vilayətdə verib həqqə rəvac,
Ürəyi sidq ilə tək Allaha müncər oldu.

Novruz günü Həzrəti-İbrahim(ə)bütləri sındırdı. «Peyğəmbər (s) səhabələrə Əliyə (ə) beyət edin əmri verdi». Bu gün bizim Qaimimiz (12-ci imam) qiyam edəcək. Biz hər novruzda fərəci arzulayırıq. Çünki bu gün bizim və şiələrimizin günüdür. (Biharul-ənvar, 56/91).

İmam Əli (ə) üçün faluzəc (şirniyyat) hədiyyə gətirdilər. Buyurdu: Bu nədir? Dedilər: Bu gün novruzdur. Buyurdu: Əgər bacarsanız, hər gün novruz edin. (Yəni: Allaha xatir bir-birinizə hədiyyə verin və bir-birinizin görüşünə gedin.) ("Dəaimul-islam", İbn Həyyun, 2/326).

İmam Sadiq (ə) buyurub: "Elə bir Novruz yoxdur ki, biz o, gün fərəcin intizarında olmayaq. Çünki Novruz Bizim və Şiələrimizin günüdür" ("Müstədrəkil-Vəsail", cild. 6. Səh. 352).

***

Novruz günü baş vermiş əlamətdar hadısələrin ən mühümü "Qədir-Xum" hadisəsidir. İslam bayramlarının içində heç bir bayram "Qədir-Xum" bayramı qədər uca deyil. Bildiyimiz kimi, Qədir-Xum günü hicri tarixi ilə 10-cu ilin Zilhiccə ayının 18-də olmuşdur ki, bu gün mart ayının 21-inə təsadüf etmişdir. Və bu hesablama da İmamların (ə) elmi möcüzələrindəndir.

İbn Fəhd Hilli özünün "Muhəzzibul bari" kitabında yazır: "Novruz gününün fəzilət və üstünlüyü ilə əlaqədar nəql edilmiş və bizim sözlərimizi təsdiq edən hədislərdən biri də Əllamə Seyyid Bəhaəddin Əli ibn Əbdulhəmidin sənəd ilə Muəlla ibn Xunəysdəndir ki, İmam Cəfər Sadiqdən (ə) belə nəql edir: "Həqiqətən Novruz günü həmin gündür ki, "Qədir Xumda" Həzrəti- Muhəmməd (s) Əli (ə) üçün müsəlmanlardan beyət aldı və müsəlmanlar Əliyə (ə) beyət etdilər. Xoş o adamların halına ki, ömürlərinin sonunadək bu beyətə sadiq qaldılar. Vay olsun o adamların

halına ki, beyətlərini sındırdılar".

Bu hədisi Əllamə Məclisi də "Biharul ənvar" kitabının 37-ci cildinin 108-ci səhifəsində nəql etmişdir. Onu da qeyd edək ki, Əllamə Məclisi "Biharul-Ənvar" kitabının 56-cı cildində bu hədisin üzərində 53 səhifəlik araşdırma apararaq 10-cu ilin Zilhiccə ayının 18-inin mart ayının 21-inə təsadüf etdiyini sübut etmişdir.

Həzrəti-Əlinin (ə) xilafətə "Qədir-Xum" günü vəsi seçilməsi Novruz günündə olmuşdur. S.Ə.Nəbati də bu deyilənləri təsdiq edir və "Görünür" rədifli şeirində yazır:

Bəzmi vəhdətdə bu gün özgə tədarük qurulur,
"Qul-kəfa" şahinə övradi-mübarək toxunur,
"Həl-əta" surəsi "vən-nəcmü" təbarək oxunur,
"Vəz-züha" təxtinə Soltan Şahi-Mərdan görünür.

İlahiyyatçı alimlərimizdən Natiq Rəhimov "Təbiətin bayramı" adlanan məqaləsində yazır: "Müasir cəfəri alimlərindən Ayətullah Cəvadi Amuli də "Məfatihül-həyat" kitabında Qədir-Xum gününün şəmsi təqvimlə 27 isfənd gününə təsadüf etdiyini yazır ki, bu da miladi təqvimlə 632-ci il mart ayının 18-i deməkdir. Böyük nücum və riyaziyyat alimi Əllamə Şərani də hesablamalar nəticəsində bu fikrə gəlmişdi. Peyğəmbərin (s) Qədir-Xümdə 3 gün qaldığını və bu müddət boyunca Həzrət Əlinin təbrik mərasiminin davam etdiyini nəzərə alsaq, Novruz bayramının da bu mərasimlə eyni vaxta düşdüyünü qəbul etməliyik. Novruzun tarixini İranla bağlamaq istəyənlər etiraz edib deyə bilərlər ki, bu bayramın Qədir-Xum gününə təsadüf etməsini Səfəvilər dövrünün şiə alimləri özlərindən uydurmuşlar. Amma bu gün əldə olan istənilən sinxron cədvəllərlə (saytımızın "konvertor" bölümündəki elektron

hesablayıcı da daxil olmaqla) deyilənlərin doğru olduğunu əyani şəkildə görmək mümkündür.

Monqollar dövründə yaşamış məşhur nücum və şəriət alimi Qiyasəddin Cəmşid Kaşani özünün "Risaleyi-Ğədiriyyə"sində məsələyə bəzi başqa nüanslar da əlavə edir. Onun yazdığından məlum olur ki, hicri 10-cu ildə (Qədir-Xum hadisəsinin baş verdiyi ildə) müsəlmanlar Şəban, Ramazan, Şəvval və Zilqədə aylarını ardıcıl olaraq 30 gün qəbul etmişdilər. Müəllif bunu Ayın görünməməsi ilə izah edir. (Ardıcıl olaraq 4 ayın 30 gün olması astronomik və şərti cəhətdən mümkündür; bax: "Təhzibül-ehkam", 4-cü cild, səh. 241, ətək yazısı). Müəllif bu nəticəyə gəlir ki, əslində Qədir-Xum gününü şəmsi (və ya miladi) təqvimə çevirərkən, bu iki gün artımını da nəzərə almaq lazımdır. Belə isə, həmin iki günü əlavə edəndə Qədir-Xum gününün düz yeni Günəş ilinin başlanğıcına (fərvərdin ayının 1-nə), başqa sözlə desək, mart ayının 20-nə və Novruz bayramına təsadüf etdiyini alırıq".

Haqq aşiqi Dədə Ələsgərin ustadı Aşıq Alı Həzrəti-Əlinin (ə) Novruz günü qırmızı geyinib taxta çıxmasını "Qırmızı" rədifli divanisində poetik misralarla belə təqdim etmişdir.

Şahi-Mərdan bayram günü geyindi don qırmızı,
İsmayıla gəlib qurban töküldü qan qırmızı.
Oxudu "İsmi-əzəm"i bağladı Zülfüqarı,
Çaldı qılıncı Əntərə, oldu meydan qırmızı.

Buyurun mirzələrə, belə yazsın yazını:
Aşıq gərək püxtə olsun, xam bilməsin özünü.
Öz- özünə fikr eyləsin, xub danışsın sözünü,
Girsin eşqin kürəsində bişsin büryan qırmızı.

Alı deyər: viranədir, uçub bu könlüm pərgarı,
Ustada qulluq etməyən kim olar xiridarı?!
Mənnən bəhsə duran aşıq gəlsin dursun üz barı,
Sərraf mənəm, istəyirəm ləli-mərcan qırmızı.

İlahiyyatçı araşdırmaçı Mahir Şəkərovun “İslamda vardır” kitabında Novruz bayramının dini bir ayin və bayram olmadığını, bu bayramı İslam dininin gətirmədiyini, lakin islamın heç bir zaman Novruzla mübarizə aparmadığını, Novruzu haram və qadağan edən heç bir göstəriş vermədiyini, əksinə, Quran və sünnədə Novruz bayramını təsdiq edən bir çox faktların mövcud olduğunu qeyd edir və araşdırmasında Novruzun ümümbəşəri bir bayram və təbiət bayramı olduğunu göstərir. Müəllif Novruz əleyhinə olan və Peyğəmbərimizə (s) aid edilən zəif və saxta hədisləri tənqid edir, iradlarını bildirir və təfsirlərə müraciət edərək, həqiqəti açıqlamağa çılışır. Peyğəmbərin (s) və Həzrəti-Əli (ə) Novruzu qadağan edən sözlər söyləmədiyini, ravilərin yalan hədislər uydurduğunu diqqətə çatdıran tədqiqatçı Qurani-Kərimə istinad edərək yazır: “Novruz əhlisünnə təfsirlərində “Taha” surəsinin 59-cu ayəsində əhlisünnənin görkəmli təfsir alimi Zəməxşəri “Kəşşsaf” təfsirində bu haqda danışır. O cümlədən, Sələbi ”Əl-Kəşfu vəl Bəyan”, Səmərqəndi “Bəhlul-ülum”, Müqatil ibn Süleyman “Təfsirul-Müqatil”, Cəlaləddin Süyuti “Əd-dürrul-Mənsur” əsərində “Taha” surəsindəki “zinət günü”nün Novruz bayramı günü olduğunu söyləyir. (Musa) dedi: “Sizə verilən vədə zinət gününüz və camaatın (bir yerə) toplaşacağı günorta vaxtıdır!” (“Taha” 59)

Əhli-sünnə alimi Zəməxşəri “Əl-kəşşaf” əsərində yazır: “Bu günə ona görə zinət günü deyirlər ki, bu gündə

bayram edilir. Zinət paltarları geyinilir və hər şeyə yaraşıq verilir. "Bəzi təfsirlərdə isə "yəvmuz-zinət", "zinət günü" ifadəsi haqda belə yazılır: "O günün konkret olaraq hansı gün olması bilinməsə belə, bilinən bir şey var. O da həmin günün bayram olmasıdır. İnsanlar o gündə sevinir, yaraşıqlı paltarlarını geyinir və həmin günü bayram edirlər". Bu sözün özü də mühumdür. Çünki müxaliflər Novruz günü sevinməyi, bayram qəsdi ilə təzə paltar geyinməyi, hədiyyələşməyi haram hesab edirlər. Bu iddialarının isə heç bir əsası yoxdur". Müəllif sözünə davam edərək yazır: "Misir camaatının yaraşıqlı paltar geyinməsi, bəzənməsi, sevinc halında olması bəzi bayram müxaliflərinin sözünü aradan aparır. Deməli, bayram günü bu işləri etməyin heç bir eybi yoxdur. Məlumat üçün bildirək ki, bəzi mənbələr həmin günün Misir xalqının təqviminə əsasən yeni illərinin daxil olması günü olduğunu qeyd edir. Xüsusi qeyd: Bəzi təfsirlərdə həmin bayram gününün Novruz və Aşura olması qeyd olunur. Bildiyimiz kimi, Aşura günü bayram yox, əziz Peyğəmbərimizin (s) nəvəsi Həzrət Hüseynin (ə) ailəsi və dostlarının faciəli şəkildə Kərbəla çölündə şəhid edilmə günüdür. Özünü Peyğəmbərə (s) aid bilən heç bir müsəlman bu günü bayram etməz. Digər tərəfdən, məgər Həzrət Musa (ə) zamanında ondan əsrlər sonra baş verəcək Aşura hadisəsi camaat arasında aktual idimi? Əlbəttə ki, xeyr. Aşura qeydini gətirən müfəssirlər görəsən hansı təqvimə əsasən vaxtı hesablayıb bu qənaətə gəliblər? Həmin günün bayram olmasından və insanların bəzənib gözəl paltarlarını geyinilməsindən söz açılır. Yenə haqlı olaraq sual yaranır: "Məgər Aşura günü bayram günüdür?". Peyğəmbər (s) nəvəsi şəhid olub deyə Musa (ə) və qövmü bayram edir? Axı biz bilirik ki, peyğəmbərlər həm də qardaş hesab olunurlar. Bir qardaşa müsibət üz gətirib

deyə digəri bayram edir? Ayənin konteksindən çıxış edib asanlıqla deyə bilərik ki, həmin gün bayram günü idi və bir sıra təfsirlər o bayramın Novruz olması qənaətindədirlər.

## İSLAM DİNİNƏ GÖRƏ NOVRUZDA OLAN QADAĞALAR VƏ İCAZƏ VERILƏN İŞLƏR

Bu barədə müctəhid (ictihad sahibi) Ayətullah Seyyid Əli Sistani ağanın fətvasına əsasən əmr olunan qadağalar və görülməli olan işlər əsasən bunlardan ibarətdir:

### Q A D A Ğ A L A R

1.Papaq atmaq (ev yiyəsinin bir şeyi olmaz, qoymağa utanar).

2.Qulaq falı (Kimsənin evini dinləmək ədəbsizlikdir).

3.Fala baxmaq (Fal böyük günahlardandır).

4.Od yandırmaq və üstündən tullanmaq (İsraf və xurafatdır).

5.Yumurta döyüşdürmək (Udmaq, uduzmaq və mərc olduğu üçün günahdır).

6.Xoruz və s. heyvanları döyüşdürmək (Heyvana əziyyət və mərc olduğu üçün günahdır).

### İCAZƏ VERİLƏN İŞLƏR

1.Sileyi-rəhm. Yəni qohumlari ziyarət etmək (Bu qohumlar arasında əlaqələri möhkəmləndirir).

2.Bir-birinə hədiyyə vermək və bayramlaşlaq (Bu məhəbbət və sevgini çoxaldır və qəlbləri sevindirir).

3.Evləri təmizləmək (İslamda təmizlik ən gözəl işlərdən biridi).

4.Küsülü qalmamaq və küsülüləri barışdırmaq (Müsəlmanın müsəlmandan 3 gündən artıq küsülü qalması haramdır).

## NOVRUZ BAYRAMININ NAMAZI

İslam şəriətinə əsasən Novruz bayramınqa qüsl almaq, təmiz paltarlar geyinmək, oruc tutmaq, Novruz bayramı namazını qılmaq çox savab əməllərdəndir, müstəhəbdir.

İmam Cəfər Sadiq (ə) buyurur: “Novruz günü olanda qüsl al, təmiz paltarlar geyin, özünə gözəl iyli ətir vur, həmin günü oruc tut.

“Zöhr” və “Əsr” namazlarını nafilələri ilə qıldıqdan sonra 4 rəkətli (2 ədəd 2 rükətli) namaz qıl.

Birinci rəkətdə Fatihədən sonra 10 dəfə “Qədr” surəsi,

2-ci rükətdə Fatihədən sonra 10 dəfə “Kafirun” surəsi,

3-cü rükətdə Fatihədən sonra 10 dəfə “İxlas” surəsi,

4-cü rəkətdə Fatihədən sonra 10 dəfə “Fələq” və “Nas” surələrini oxuyarsan.

Namazı bitirdikdən sonra şükür səcdəsi et və dua et. Sənin 50 illik günahın bağışlanar” (Vəsailüş-şiə, 8-ci cild 173-cü səhifə).

***

Şeyx Tusi (vəfatı 460 h.q.) adından “Misbahul-mutəhəccid” kitabında nəql olunan hədis:

İmam Sadiq (ə) Muəlla ibni Xuneysə dedi: “Elə ki, Novruz günü oldu qüsl et, ən təmiz paltarını geyin, ən yaxşı ətirlə ətirlən, o günü oruc tut və zöhr-əsr namazlarından sonra (xüsusi qaydaları ilə) 4 rükət namaz qıl və dua

et ki, 50 illik günahların bağışlanar" ("Vəsailuş-şiə" c.8, səh. 172-173, hədis 10338; "Misbahul mutə həccid" səh. 790).

***

Novruz bayramının namazı bu qayda ilə qılınır: İmam Sadiq (ə) buyurmuşdur: Novruz bayramında qüsl et, təmiz paltar geyin, ətir vur və oruc tut. "Zöhr" namazının naïflə-sindən sonra dörd rükət namaz qıl. Birinci rükətdə "Fatihə" surəsindən sonra on dəfə Qədr surəsin oxu. İkinci rükətdə "Fatihə" surəsindən sonra on dəfə "Kafirun" surəsi, üçüncü rükətdə "Fatihə" surəsindən sonra on dəfə "İxlas" surəsi dördüncü rükətdə isə "Fatihə" surəsindən sonra "Fələq" və "Nas" surəsini oxu. Namazdan sonra şükür səcdəsi və dua et (Misbahul-mütəhəccid,s, 591).

# BƏNÖVŞƏNİ
(Dirili Qurbani)

Yaradıcılığı ilə şöhrətə sahib olmuş bir çox dahi sənətkarların yaradıcılığında çox dəyərli və fərqli bir əsəri olur. Nizami Gəncəvi “Xəmsə”si, M.Füzuli “Leyli və Məcnun”u, Ş.İ.Xətai “Dəhnamə”si ilə tanındığı kimi Dirili Qurbani dedikdə də hamının yadına məhz, “Bənövşəni” rədifli qoşması düşür. Baharı novruzgülüsüz və bənövşəsiz təsəvvür etmək mümkün deyil. Bənövşə ətri ilə insanı bihuş edən, gözəlliyi ilə məsumluq mücəssəməsi olan bir yaz çiçəyidir. Onu yalnız Qurbani bu qədər zərif, bu qədər incə təqdim edə bilər. Azərbaycan Respublikasının xalq artisti, bəstəkar Səid Rüstəmov həmin parçaya musiqi bəstələmiş, illərlə bir çox sənətkarlar bu mahnını ifa etmişdir. Mahnını dinləyəndə üç mükəmməl sənətkarın - yazarın, bəstəçinin və ifaçının ən insani, bahar qoxulu duyğuları insanı sehrləyir. Xüsusilə bəstəkar Qurbanini dərindən hiss edərək hər bəndin sonunda səs tonunu bir dəfə zilə qaldırmaqla yaddaqalan xallar vurmuşdur. Bu da mahnını yaddaqalan, həmişəyaşar edir.

Bir daha Aşıq Qurbani dühası və “Bənövşəni” sizə xatırlatmaqla Novruz əhval-ruhiyyəsinə köklənməyinizi diləyirik. Hesab edirik ki, bu qoşmanın bu dərgidə yeri var.

Başına döndüyüm ay qəşəng pəri,
Adətdi, dərəllər yaz bənövşəni.
Ağ nazik əlinlə dər, dəstə bağla,
Tər buxaq altında düz bənövşəni.

Tanrı səni xoş camala yetirmiş,
Səni görən aşiq ağlın itirmiş,

Mələklərmi dərmiş, göydən gətirmiş?
Heyif ki, dəriblər az bənövşəni.

Başına döndüyüm, bağa gəl, bağa,
O gözəl hüsnündən bağa nur yağa.
Dəstə-dəstə dərib taxar buxağa,
Bənövşə qız iylər, qız bənövşəni.

Səhər olcaq şeyda bülbül oxuşdu,
Hökm olundu, süleymanlar yerişdi,
Sərt qış gəldi, gülün vaxtı sovuşdu,
Daha iyləmirik biz bənövşəni.

Qurbani der: Könlüm bundan sayrıdı,
Nə etmişəm yarım məndən ayrıdı?!
Ayrılıqmı çəkib boynu əyridi?!
Heç yerdə görmədim düz bənövşəni.

***İlyas Qəmginin (Allahverdiyev)***

## YAZDA KOL DİBİNDƏ BİTƏN BƏNÖVŞƏ

Yazda kol dibində bitən bənövşə,
Yolunu gözlədim, bu il gəlmədin.
A zərif boynunu bükən bənövşə,
Mən nələr düşündüm, bu il bilmədin.

Yəqin həsrət qaldın əl sığalına,
Gözlərin sarala-sarala qaldı.
Bu yurdun qisası bir gün alınar,
Dağlar inanmıram marala qaldı.

*Rauf İLYASOĞLU*

**BƏNÖVŞƏ**

Çiçəkli dağları dolandım yenə,
Həsrətlə axtardım səni, bənövşə!
Görəndə sevinib, dərəndə necə,
Ətrindən doymadım sənin, bənövşə!

Bəlkə də, gizlicə baxırsan yana,
Tamarzı qalmısan əl sığalına.
Şaxta sənə qıysa, alışıb yana,
Var güllər içində xətrin, bənövşə!

Dağlarım dumana, çənə bürünür,
Çəməni gəzirəm yerin görünür.
Boynu bükük çöhrən necə bilinir?
Yayıla hər yana ətrin, bənövşə!

Yağmalandı yurdum, o doğma elim,
Yetişə bilmədi bir yana əlim.
Bitmisən bəlkə də buludda, gülüm,
Hanı dəstə-dəstə çətrin, bənövşə?

Gəzərəm elləri hər yaz gələndə,
Tapsam sevinərəm səni görəndə.
Xalqım zəfər çalar, deyib, güləndə,
Qalsın könüllərdə sətrin, bənövşə,
Raufun qəlbində ətrin, bənövşə.

## BAYRAMA HƏSR OLUNMUŞ ŞEİRLƏR

*DİRİLİ QURBANİ*

### SEVİNSİN

Ay ariflər, bu dünyanın üzündə
Təzəcə açılan güllər sevinsin!
Bir əyri çalmalı, xumar gözünün,
Zülfünü dağıdan yellər sevinsin!

Gəlsin bahar fəsli, açılsın yazlar,
Göllərə tökülsün ağ quba qazlar,
Bəyzadə oğlanlar, xanzada qızlar,
Yar ilə danışan dillər sevinsin!

Qurbaniyəm, mən sevərəm Narıncı,
Yar-yar deyib oldum axır zarıncı,
Almanı, heyvanı, narı, turuncu,
Bu dördünü dərən əllər sevinsin!

*Molla Pənah Vaqif*

## Bayram oldu

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdur.
Dügüylə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm, dəxi qoymazlar kəndə.
Xalq batıb noğula, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə evdə bir sahibcamalımız var.
Vaqif, öyünmə ki, kamalımız var,
Allaha şükür ki, kamal da yoxdur.

*Qasım bəy Zakir*

## OLDU

Keçdi növbəti-zimistan,
Yenə fəsli-bahar oldu.
Əndəlibi-binəvanın
Sənəti ahü zar oldu.

Yasəmənü gülü lalə
Bir çəməndə qurub halə;
Ərğüvan tutub piyalə,
Nərgiz içib xumar oldu.

Əmr olundu, abi-niysan!
Cansızlara bəxş etdi can.
Yenə təzələndi dövran,
Nə gözəl ruzigar oldu!

Səbzpuş olub çəmənlər,
Qaldıdı hər şükufə sər.
Oyan, ey bəxti-bixəbər,
Yatan hamı bidar oldu.

Əlac oldu hər bimarə,
Tapıldı dərdinə çarə.
Elə, həsrət qalan yarə
Zakiri-dilfikar oldu.

*Cəfər Cabbarlı*

**BAHAR**

Novbahar oldu, günəş şöləlmənib nur saçır,
Qar ərir, sellər axır, ot göyərir səhradə.
Yeni çıxmış gülə baxdıqca da bülbül dil açır,
Gül budağına qonub nəğmə oxur azadə.

Dərələr, dağlar, ağaclar yaşıl, əlvan hər yan,
Sərbəsər xələti-ətləslə bəzənmiş gülşən,
Bu nə qüdrət ki, ona olmamaq olmaz heyran!
Xaliqin qüdrəti-bihəddinə əhsən, əhsən!

Ah, yellər nə həzin, fikr elə, san ney çalınır,
Hanı bəs qışdakı evlər uçuran qüdrətiniz?
İndi gör əsməyinizdən nə gözəl zövq alınır!
Unudulmuş o sudan qar yaradan hiddətiniz.

Bağa bax, bostana bax,  bağçaya bax, gülləri gör,
Güllü gör, bülbülü gör, zövq apar dünyadən.
Xaliqin qüdrətini bil, bu yaranmışları gör,
Yatma, dur bax, götür əl qəfləti-bipərvadən!

*Səməd Vurğun*

# Bahar

Bahar, istəklimsən başdan-binadan,
Ən gözəl qızısan sən təbiətin.
Xoşbəxt yaranmısan xoşbəxt anadan,
Gözünün odusan şeirin, sənətin,
Ən gözəl qızısan sən təbiətin.
Mənim də şair tək qanım qaynardır,
Yerdə arzularım gül açır rəng-rəng.
Başımda daima fikirlər vardır,
Daima döyünür sinəmdə ürək,
Yerdə arzularım gül açır rəng-rəng.
Sükuta düşmənsən əzəldən sən də,
Nə yatır, nə də bir sakit olursan.
Çöllərə min yaşıl xalı sərsən də,
Çarpışıb yağışla, boranla, qarla,
Qışın son nəfəsi qasırğalarla.
Sən də döyüşlərdə yaşa dolursan,
Nə yatır, nə də bir sakit olursan.
Buludlar qoynunda çaxan şimşəyin,
Sivri qılınc kimi sıyrılır qından.
Tufan da qoparır bəzən küləyin,
Dağlara səs düşür qışqırığından.
Bahar, qoy suların gurhagur axsın,
Sinəmin üstündən keçsin sellərin.
Başımın üstündə şimşək də çaxsın,
Qoy tufan qoparsın əsən yellərin.
Doyunca çarpışıb qasırğalarla,

Göydə qartal kimi yorulum mən də.
Sonra qoşa yatıb dostum baharla,
Baş-başa dincəlim bir göy çəməndə.
Dən olub səpilək gəl səninlə mən,
Göyərək torpaqda sünbüllər kimi.
Qızlar gülab çəksin qoy ətrimizdən,
Baharın zinəti al güllər kimi.
Qoşa çinar olub bitək yol üstə,
Göylərə boy ataq öz ölkəmizdə.
Yayın istisində Muğanda, Mildə,
Yolçular dincəlsin qoy kölgəmizdə.
Ya da dağ döşündə qoşa qaynayan,
Ürək sərinlədən çeşmələr olaq.
Yerdə bulud-bulud axıb oynayan,
Sərin çaylar kimi axdıqca dolaq,
Ürək sərinlədən çeşmələr olaq.
Yer qazaq, su çəkək boz səhralara,
Daş yonaq, söz yazaq iti əl kimi,
Göyləri şimşək tək biz yara-yara,
Gəzək yer üzünü bir əməl kimi.
Bir cüt ala gözlü göyərçin olub,
Gəl, Yer kürrəsinin çiyninə qonaq.
Şeir tək dillənib, nəğmə tək ötüb,
Dildən-dilə düşək, əzbər oxunaq.
Bir cüt məşəl olsun ürəklərimiz,
Bir cüt ulduz kimi baş-başa yanaq.
Sülhün, səadətin keşiyində biz
Gəl qoşa dayanaq, qoşa da yanaq.
Min il ömür sürək səninlə qoşa,
Bir canda döyünən iki ürək tək.
Min il nəfəs verək torpağa, daşa,
Nəsildən-nəsilə təzələşərək.

*Aşıq Alı*

## Olmadı

Bayram oldu, küllü aləm bəzəndi,
Heç mənim halımı bilən olmadı.
Dost-dostu çağırdı, qohum qohumu,
Mən qəribi yada salan olmadı.

Al geydi, sallandı xublar dəstəsi,
Kəkliktək dağlara düşübdü səsi,
Hicran xəstəsiyəm, qəm şikəstəsi,
Heç yanıma gedib-gələn olmadı.

Kimi dostnan gəzdi, kimi yoldaşnan,
Aşıq Alı qaldı gözü qan-yaşnan.
Analar oğulnan, bacı qardaşnan,
Heç mənim halıma qalan olmadı.

*Aşıq Ələsgər*

## DAĞLAR

Bahar fəsli, yaz ayları gələndə,
Süsənli, sünbüllü, lalalı dağlar.
Yoxsulu, ərbabı, şahı, gədanı,
Tutmaz bir-birindən aralı dağlar!

Xəstə üçün təpəsində qar olur,
Hər cür çiçək açır laləzar olur.
Çeşməsindən abi-həyat car olur,
Dağıdır möhnəti-məlalı dağlar!

Yazın bir ayıdı  çox yaxşı çağın,
Kəsilməz çeşməndən gözəl yığnağın.
Axtarma motalın, yağın, qaymağın,
Zənbur çiçəyindən bal alı dağlar!

Yayın əvvəlində dönürsən xana,
Son ayda bənzərsən yetkin bostana.
Payızın zəmhəri qoyar virana,
Dağıdar üstündən cəlalı, dağlar!

Gahdan çiskin tökər, gah duman eylər,
Gah gəlib-gedəni peşiman eylər.
Gahdan qeyzə gələr, nahaq qan eylər,
Dinşəməz haramı, halalı dağlar!

Ağ xələt bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib, xətrinə dəyməz.
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli-qalalı dağlar!

Köçər ellər, düşər səndən aralı,
Firqətindən gül-nərgizin saralı.
Ələsgər Məcnun tək yardan yaralı,
Gəzər səndə dərdli, nalalı, dağlar!

*S.M.Şəhriyar*

## “ƏSLİ -KƏRƏM” ŞEİRİNƏ BİR HAŞİYƏ
## (“Əsli- Kərəm” dastanından)

“Kərəm deyər: Mən bir səfil səyyadam,
Hər marala tor ataram , maar gəli.
Yar bağının bülbülləri oxuyur,
Bizim yurda seyrə də yox, sar gəli”.
Evdə bir il ah çəkərəm, cavab yox,
Evdən çıxan mən o yana, yar gəli.
Tay tuşlarım çölə çıxa, gün çıxar,
Mən çıxanda yağış getsə, qar gəli.
Yazıq quzum, aclığa döz, darıxma,
Bu gün -sabah bahar gəli, bar gəli.

Bizə gələ- gəlməyə bir kal iydə,
Qonşumuza heyva gəli, nar gəli.
Xan evinə şir gələ quyruy bular,
Bizim evə kor it gələ, har gəli.
Xəlqə qonaq gələ gözü sürməli,
Bizim evdən kor getməmiş kar gəli.
Bəxtimə arvad nə çıxa bilmirəm,
Bəllidi ki, sarsağa sovsar gəli.
Bir “üç ətək” əndazədir əynimə,
“Salisburi” gen gəlməsə, dar gəli.
Dövlətliyə yas da gələ oynayar,
Biz kasıba toy gələ, axsar gəli.

Qəm yükündən kəndxudanın hissəsi,
Xərdəl olu: bizimki xalvar gəli.
Kətdə bizi döyüllə, bir havar yox,

Biz bir kəlmə hər danışaq, car gəli.
Darğa şayırtlar  bizə sərkar çıxar,
Dar  dibindən qurtula sərdar gəli.
Bundan belə özgə kərəm özgədən,
Minnət çəkir, qeyrətimə ar gəli.
İşçi toyuq kəsəndə mən baxmanam,
Bilməm  necə ürəyimdən var gəli?
Qəmdən mənim bir eynək var gözümdə,
İşıq aydın, gün gözümə tar gəli.
Eşqim düşüb yadıma gözlər daşar,
Baharda sel atlanı, çaylar gəli.
Çox şairin təbi donar buz kimi,
Şəhriyarın şeiri də qaynar gəli.

*Əlağa Bakir*

***

Bayramlar içində  lə'li-gövhərdir bu Novruz.
Dillərdə min illərdir ki, əzbərdir bu Novruz.

Ellər ona ad verdi əzəldən təzə bir gün,
Ondan sonrakı illərdə rəhbərdi bu Novruz.

Dünya evinin zinəti daim ona rövnəq,
Cənnət bahara ilk qədəmi-zərdi bu Novruz.

Hər bir bəşərə,canlıya həm torpağa daim,
Öz nuri ilə can verən ürəkərdi bu Novruz.

Övladi-bəşər ruha gəlir ilk qədəmindən,
Gül butəsi tək qönçeyi bir tərdi bu Novruz.

Hər yerdə gözəl rəmzi olan göy səməniylə,
Hər nemətlə dolu süfrəsini sərdi bu Novruz.

Minlərlə küsənlər barışır,qəlbi olur şad
Yaddan çıxarır qüssəni, hər dərdi bu Novruz.

Qəlbində fərəh şadlıq edən ellərimiztək,
Bakir də müdam var ola istərdi bu Novruz.

*HACI MAİL*

***

Bir ildü səni gözləyirik, gəl bizə, Novruz!
Gəl, xoş qədəminlə bu cahanı bəzə, Novruz!

Gəl, gəl ki, dirilsin nə qədər qışda ölən var,
Hər şey nəfəsinlə ola ta ki təzə, Novruz.

Məşşatə olubsan bu cahanı bəzəməklə,
Məşşatəlik et sözlədiyim hər sözə. Novruz.

Əlvan xalı tək ver çəmənə bir dəxi rövnəq,
Çıxsın nə qədər möcüzən olsa üzə, Novruz.

Qurtardın uzun  qış gecəsindən bizi axır,
Az qalmış idi könlümüz ondan bezə, Novruz.

Dünyada bərabərlik işi çox da bəyandır,
Səndəndü bərabər gecə həm gündüzə, Novruz.

Səndən alacaq nəşvü büma hər nə çiçək var,
Lalə olacaq qırmızı örtük düzə, Novruz.

Sən bircə bizim bayramımız olmamalıydın,
Dünyanı gərək ölkəbəölkə gəzə Novruz!

Novruz bəşərə lütfüdü, əlqissə, Xudanın,
Nur saçmalı hər qəlbə hər il, hər gözə Novruz.

Gəl, gəl ki, üzüldü canımız bu gəlişinçün,
Can verməli ikən nə gərək can üzə Novruz.

Mail sözünü dürr elə leysanın ilən sən,
Can riştəsinə ta ki, o dürrü düzə, Novruz.

*Hacı Yusif Qulammirzə oğlu*

## Gəl, Novruz bayramım, gəl

Qarşılayırıq səni əlimizdə duz-çörək,
Gəl, novruz bayramımı, gəl gəl qədəmin mübarək!
Gözləyirik yolunu, bahar ilə gəl qoşa,
Ürəkləri sevindir, bizimlə bir an yaşa.
Sən gələndə təbiət yaşıl libasın geyir,
Quşlar şövqi həvəslə  şirin nəğmələr deyir.
Allahın adıyla gəl, əmin-amanlıq gətir,
Qələbə müjdəsini bu il sən bizə yetir.
Gəlişinə uşaqlar nəğmə deyib, əl çalar,
Gözəl qızlar həvəslə bəzəyərlər xonçalar.
Səməninin yanında alışar rəngbərəng şam,
Sehirli nağıl kimi gözəl olar o axşam.
Sənin gəlməyin ilə cana gəlir canlılar,
Çünki, Novruz adında baharın xoş ətri var.
Hamı səni gözləyir, vaxt yetişib, gəl daha,
Süfrəmizin başında dua edək Allaha!
Bu ruzi, bərəkəti almasın əlimizdən,
«Didərgin», «qaçqın» sözü tərk olsun dilimizdən!
Düşmən tapdaqlarında torpağımız  qalmasın,
Heç kimin qapısında qara bayram olmasın.
İlahi, aclıq ilə etmə bizi imtahan,
Müharibə görməsin millətimiz heç zaman!
Bərəkətli əlini kasıblara uzat Sən,
Heç kim məhrum olmasın sonsuz səxavətindən!
Sevənlər, sevilənlər muradına yetişsin,
Küsən, sınmış könüllər bir-birinə bitişsin.

Dərgahına əl açıb deyək ey Pərvərdigar,
Başımızın üstündən keçsin qara buludlar!
Ağ birçəkli analar oğul dağı görməsin,
İgid oğlanlarını bir də şəhid verməsin!
Heç kim ayrı düşməsin öz isti ocağından,
Xalqımız bir-birinə osun əziz, mehriban!
Gələn Novruza qədər Qələbəni qeyd edək,
Xankəndinin özünə, bayramlığa biz gedək!
At oynatsın igidlər doğma Cıdır düzündə,
Bir nəfər də didərgin qalmasın yer üzündə!
Bu gözəl arzulara: Amin! İlahi Amin!
Hər şeyi həll edənsən, Sən ey Rəbbil Aləmin!

*Axund Hacı Soltan Hüseynqulu oğlu*

## *Novruz bayramı*

*Ən xoş fəslə düşən, ən xoş zamandı,*
*Baharın hördüyü çələngdi Novruz.*
*Səmənə bəzəkdir yaşıllığıyla,*
*İslamın rəngi tək qəşəngdir Novruz.*

*Gözlərdə görünür həyat həvəsi,*
*Dolur sinəmizə bahar nəfəsi,*
*Çalınır hər yanda eşqin nəğməsi,*
*Könül rübabında ahəngdir Novruz.*

*Vüsal məlhəm çəkir hicran dağına,*
*Qocalıq qayıdır gənclik çağına.*
*Sevib - sevilməkçün könük bağına,*
*Düşən min naxışdı, min rəngdir Novruz.*

*Qışın sərtliyindən təbiət azad,*
*Bülbüllər cəh-cəhin eliyir icad,*
*Bu təhvil – təslimdən naşad olur şad,*
*Qüssəni ötürən son zəngdir Novruz.*

*Soltan, hamı gəlir mubarək deyə,*
*Bəs Qarabağ matəm geyinib niyə?*
*Bu bayram çağırır xalqı birliyə,*
*Həm mübarizədir, həm cəngdi Novruz.*

***21 mart 2002***

*Kərəm Kürqıraxlı*

# NOVRUZ BAYRAMI

Aylar təzələnir, il təzələnir,
Bülbül cəh-cəh vurur gül təzələnir.
Dağın zirvəsində sel təzələnir,
Gülür, şadlıq edir, cahanda hamı,
Yurda xoş gəlmisən, Novruz bayramı.

Sənin gəlişinlə hamı şadlanır,
Küsülü olanlar bir-birin anır,
Günəş də göylərdə şövq ilə yanır,
Coşur ürəklərin arzusu-kamı,
Yurda xoş gəlmisən, Novruz bayramı.

Sən bizə əzizsən sərvətdən, vardan,
Düzdə çəmənlərdən, zirvədə qardan.
Süfrəyə düzülən paxlavalardan,
Yedikcə çoxalır ağzımın tamı,
Yurda xoş gəlmisən, Novruz bayramı.

Sevgidən şadlanır, coşur ürəklər,
Aləmə sığmayır arzu diləklər.
Çəmənə zinətdir güllər, çiçəklər,
A dostlar gətirin, yandırın şamı,
Yurda xoş gəlmisən, Novruz bayramı.

Hər nemət bəzəkdi belə bir yurda,
Ürək vəcdə gəlir yarat da, qur da.
Kərəm şeiri yazdı, bu Zəngəzurda
Süfrəyə bəzəkdi Cəmşidin camı,
Yurda xoş gəlmisən, Novruz bayramı.

*Fəxrəddin Meydanlı*

## Bahar

Bahar-fəsillərin şahı,
Alaçalponun son sabahı.
Ana torpaq gəlir cana,
Canlı nə var-dolur qana.
Günəş gülür, nurun saçır,
Tumurcuqlar çiçək açır.
Donun açır şirin bulaq,
Qaranquşlar gəlir qonaq.
Yaşıllaşır çəmən, yamac,
Gülür budaq, gülür ağac.
Qız gəlinin su əlində,
Yasəmənlər kol dibində.
Səmənilər xonçalarda,
Şirin-şərbət dolçalarda.
Şorqoğalı, şəkərbura,
Paxlavamız tikə, para.
Yumurtalar al qırmızı,
Üstündə var bir ad, yazı.
Döşəməli plov dəmdə,
Colma cocuq min aləmdə.
Süfrədə var yeddi löyün,
Rəbbim verib, nuş et, öyün.
Xoşca gəlsin baharımız,
Yeni bir gün- Novruzumuz.
Hər bir kəsə ümdə dilək,
Bol bərəkət, ruzi, çörək.
Hər bayramdə biz görüşək,
Novruzumuz həp mübarək.
Meydanlıdan sizə təbrik,
Sevinin ki, olum şərik.

*Rahim Çətinqaya Rahimi*

## N O V R U Z

Dağlarda çiçəkdir, aranda çəmən,
İgidin könlündə yardı bu bayram.
Kimi nərgiz sevər, kimi yasəmən,
Sinəmdə əriyən qardı bu bayram.

Yandırdım atəşi atil-batilə,
Atladım üstündən, bəxtim açılə.
Getsin bu agırlıq, bitsin bu çilə,
Agaclarda açan bardı bu bayram.

Bu bayram alacam xələt bacıma,
Bu bayram salacam şənlik acıma.
Bu bayram bir umud dolur içimə,
Ürəklərdə yanan nardı bu bayram.

Açıldı lalələr, oyandı torpaq,
Mənə bay-bay edir agacda yarpaq.
Gəl də sinilərdə səməniyə bax,
Turan ellərində cardı bu bayram.

Ölüyə hörmətdir, diriyə sayğı,
Məsrəfə girməkdən edilməz qayğı.
Ən gözəl şəkildə nədir layığı,
Bütün gönülləri sardı bu bayram.

Qonşular dolanır qulaq asmağa,
Gənc qızlar yığılır qırxgöz kəsməyə.
Qapıdan şal atıb orda pusmağa
Gənclərin əlində şaldı bu bayram.

Uşaqlar dolanır pay toplamağa,
Cavanlar yığılır ip atlamaga.
Analar oturub şal baglamağa,
Qohuma, qonşuya paydı bu bayram.

Yumurta qızardıb döyüşdürərlər,
Sınıb qırılanı dəyişdirərlər.
Sonra da oturub yeyişdirərlər,
Qonfetdi, noguldu, baldı bu bayram.

Məş’əli yandırıb atardıq göyə,
Zülmət aydınlığa bürünsün deyə.
Nişanlılar gedir gəlin görməyə,
Hörmətlə içilən çaydı bu bayram.

Həyətində atəş yanar hər evin,
Nogulu, kişmişi var yeddi levin.
Rahimi deyir ki, gəl, sən də sevin,
Dadı damagımda qaldı bu bayram.

*Sona XƏYAL*

***

Nə olar olsa səadət bizə yar, gəlsə bahar,
Eyləyib öz nəfəsiylə qəmi tar, gəlsə bahar.

Novruzun xoş nəfəsin gözləyirik həsrət ilə
Ki, ürəkdən yox ola şaxta və qar, gəlsə bahar.

Keçən ildə çox olub dərdi, qəmi xəlqimizin,
Deyirəm bəlkə firavanlıq olar, gəlsə bahar.

Varlının qışda da könlündə bahardır, kasıbın
Bəlkə köksündə qubarı azalar, gəlsə bahar.

O qədər gül balalar oldu şəhid uğrunda,
Ey Sona, torpağımız azad olar, gəlsə bahar?!.

*İlqar Süleyman Bizəban*

## Bəhariyyə

Yenə nazəndə gəlin tək bəzənib gəldi bahar,
Cilvələndirdi gözəlliklərini hər nə ki,var.

Örpəyin şıltaq uşaqlar tək alıb qaçdı külək,
Zülfünü tökdü həyadən üzə ol laləüzar.

Nurə qərq etdi şəfəq rəngli saçı dünyanı,
Bülbül əfğanə  gəlib gül elədi ətr nisar.

Lalələr qucdu kəmər tək çəmənin incə belin,
Çəkdi sünbül bərəkət müjdəsini aləmə car.

Qurdu gülzardə məclis,olub aşiqlər cəm`,
Sinədə eşq odu,hər dildə vüsal oldu şüar.

Yığdı ulduzları ətrafına ay, rəqs elədi,
Ki,müqabildir ona, sevdiyi al üzlü nigar.

Göydə həsrətli buludlar qovuşur bir-birinə,
Ağlamazlarmı fərəhdən, yetə gər yarına-yar?

Sərv baş çəkdi göyə seyr edib hər güldə qiyam,
Bu təmənna ilə ki, Həqq edə düşmənləri xar.

Dolanıb qürbəti həsrətli bahar dönmüş elə,
Çıxdı  pişvazinə şadlıqla hərarətli diyar.

Bir mələkdir,üfürüb torpağa salmışdı toxum,
Doqquz ay bitdi,yetib və`də, gəlib ərsəyə bar.

Odlanıb yandı fərəh məş`əli, hər qəlbdə  ki,
Vəslə yetməkdə sevənlər, dağılır dərdü qubar.

Fəsli-gül,qalmaya boş Bizəban eşqin cami,
Süzə yarın meyi, mütrib oxuya, dillənə tar.

*Hacı Gülbala Fənai*

## BAHARİYYƏ QƏSİDƏSİ

Xəzan gedib tamam novbəhar oleydi cahan,
Sevənlərin başı üstən kənar oleydi duman.
Əziz oleydi bütün yaxşılar bu aləmdə,
Zəlil oleydi bu xəlq içrə xar oleydi yaman.
Bəşər müxalif oleydi xilaf və'dələrə,
Düzün əliylə bütün tar-mar oleydi yalan.
Çıxaydı mə'rifət əhli əbanın altından,
Nihan oleydi əyan, aşkar oleydi nihan.
Hər aşiqin ürəyiycən döneydi çərx müdam,
Yetəydi vəslə hamı ruzgar oleydi rəvan.

Sileydi "kaş" sözün xəlq öz kitabından,
Xilas oleydi peşimanlığın əzabından.

Behişt misli bu dünya həmişə olsun yaz,
Sürudi-eşq ilə bülbüllər eyləsin avaz.
Bu şuridən düşə gülzar içrə qovğalər,
Kəmali-hüsn ilə gül əndəlibə etsin naz.
Əsib səba yeli öz sövti-dilkeşilə, həzin
Nəvayi-bülbülə bir rəng ilə ola dəmsaz.
Tutub səmayə üzün qönçələr açıb bir-bir,
Edə Xudayi-Cəmil ilə sübh razü niyaz.
Səmayə şö'lə çəkib yerdən atəşin lalə,
Ola bu gülşən içində bir özgə suzü güdaz.

Çəməndə hiç açan qönçə solmasın, ya Rəbb,
Qəfəsdə həbs olan bülbül olmasın, ya Rəbb.

Ölüm öləydi onu dadmayaydı kaş bəşər,
Qəzayi-mövtə yazaydı qələm bu tövr qədər.
Tutaydı xəlq o şahın behişt damənini,
Cəhənnəm adlı o yerdən verilməyəydi xəbər.
Eşitməyəydi səma əhli ahi-məzlumi,
Yetəydi fərşdən ərşə fəqət sürudi-zəfər.
Məhəbbət əhlinin ahı bu çərxi-bimehrə,
Noleydi bir kərə ömründə eyləyəydi əsər.
Mənim də çərxi-fələkdən şikayətim çoxdur,
Nə tul ərz qılım qərqi-xun olubdu cigər.

Cüda qılıb məni illərdi gül'üzarımdan,
Şikəstə bülbüləm ayrılmışam baharımdan.
Nə çərx ərz qılım, çərxi-pürcəfavü sitəm,
Nə dövr ərz qılım, dövri-zül-bəlavü ələm.

Nə zülm ərz qılım, zülmi-Yusifi-Səqəfi,
Nə cövr ərz qılım görməyib ərəblə, əcəm.
Bu sinəm üstə elə dağlər çəkibdir ki,
Bu dağı dağlara çəksəydi gər, olardı ədəm.
Alışdı atəşi-hicr ilə qəlb sinəmdə,
Yaxıldı odlara, ya Rəbb, əmn olan bu hərəm.
Nəsimi-feyzin ilə, ey könüllərə sahib,
Bəhari-vüsləti-dildarım eylə, nola, kərəm.

Yenə xəzanə dönən gülşənim çiçəklənsin,
Ədalı qönçələr əvvəlki tək ləçəklənsin.

Yenə səba yeli bu gülsitanə can versin,
Yenə səbah quşu sübhdəm azan versin.
Sevinc yaşını töksün yenə yer üzrə səma,
Həyalı qönçələrə xəndə ərməğan versin.
Yenə rəvan olub o gül'üzar, gülzarə,
O sərvi bir-birinə sərvlər nişan versin.
Dönüb, xəzandə hicrət qılan qaranquşlar,
Bəhar müjdəsin, artıq yetib zaman, versin.
Fənai, vüsləti-dildarə az qalıb, istə,
Xudayi-Həyy, əcəldən sənə aman versin.

Ümidi-Vəsl ilə göz intizardır hər dəm,
Nə ki, Fənai, sən, o şahı gözləyir aləm.

*Məşədi Xalid*

***

Ey odlar yurdunun ən şanlı bayrami bəharım, gəl,
Geyib şənlik libasın, gözləyir hami, bəharım gəl.

Çəkib gülşəndə səf güllər, durub pişvazə bülbüllər,
Səbadən lalələr almış ələ cami, bəharım gəl.

Yetişsin yurduma bayram sevinciylə səfa səndən,
Al-əlvan xönçələrdə yandıraq şami, bəharım gəl.

Behişt ətrinlə canlandır yatan ruhun bu torpağın,
Duyub ətrin təbiətdən alaq kami, bəharim gəl.

Gecə-gündüz sənin vəznində tapmışdır bərabərlik
Könüllər səndən almış vəhdət ilhami, bəharım gəl.

Nəfəs ver tazə ruhunla müəttər eylə gülzari,
İlin yaz nəğməsin çal novruz əyyami, bəharım gəl.

Geyin zərrin günəş tək parla, çıx dərviş libasından
Yetər ay tək görünmək baryam axşamı, bəharım gəl.

Qədim adətlərinlə bir daha xoş töhfələr bəxş et,
Ey odlar yurdunun ən şanlı bayrami bəharım, gəl.

*Zamiq Səfai*

## Gəldi

Yenə ey dil,dolanıb fəsli-baharım gəldi,
Bu solan ömrümüzə  laləüzarım gəldi.

İncə zövq ilə gəlir süfrəyə şux xonçaları,
İçi dünya dolu,ən dadlı nübarım gəldi.

Qoca dünya hələ gənc illərini dövr eliyir,
Çalışır san ki,desin:sevgili-yarım gəldi.

Həm barışsın bütün aləmdə küsənlər bir-bir,
İndi vəslət dəmidir,mahi-nigarım gəldi.

Sən qədim Azərbaycanımızın bayramısan,
Qoy yayılsın bütün aləmdə şüarım, gəldi.

Xoş,firavan yaşasın dövrünü daim Xəlqim
Can gəlir,xilqətə dünya dolu barım gəldi.

Ey Səfai,məni məst etdi yazın mənzərəsi,
Məst gözlərlə baxan,çeşmi-xumarım gəldi.

*Mütəllim Həsənov*

## Bahar gəlir

Al günəşdən nur süzərək,
Yaxasına gül düzərək,
Əlvan xalılar çözərək,
Bahar gəlir, bahar gəlir.

Hikkəsindən qış deyinir,
Çəmən gülür, el sevinir,
Od nəfəsli torpaq gülür,
Bahar gəlir, bahar gəlir.

Bağ-bağatlar qönçələnir,
Yal-yamaclar çiçəklənir,
Arzularım gerçəklənir,
Bahar gəlir, bahar gəlir.

Bulaqlar sazın kökləyir,
Ağaclar barla yüklənir,
Hər tərəfdən nur ələnir,
Bahar gəlir, bahar gəlir.

Kəklik, turac nəğmə deyir,
Çiçəklər bir-birin öyür,
İnsan gülür, hünər gülür,
Bahar gəlir, bahar gəlir.

*Rəfiq Rəhim*

## Yaz Lövhələri

Bahar gəldi, qan qaynadı,
Cavanlığım düşdü yada.
Bahar, səndən gözəl varmı ,
Görən bu gözəl dünyada?

Bahar məhəbbətdir deyə,
Günəş güldü bu sevgiyə.
İşə bax ki, müğənniyə,
Döndü göldə qurbağa da.

Bahar qovdu qışı, qarı,
Sevindirdi uşaqları.
Gül-çiçəyə qondu arı,
Şirəsindən dada-dada.

Geyindirmişdi qar bizi,
Soyundurdu bahar bizi.
Kim axtarsa tapar bizi
Güllü-çiçəkli bağçada.

Palto satan boynu bükük,
Batan xərci ağır bir yük.
Daha dəbdən düşübdü kürk,
Gərək deyil heç bir zada.

Günəş şaxtanı itirdi,
Bom-boz çöllər gül bitirdi.
Şəhər kəndə köks ötürdü,
Kənddən dövlətli olsa da.

Ay səmada yatıb qaldı,
Qaşlarını çatıb qaldı.
Rafiq Rəhim batıb qaldı,
Gözəllik adlı dəryada.

*Yusif Dirili*

## NOVRUZUN TƏRİFİ

Novruz gəlir yurduma
Yer-Göy necə şad olur.
Küskün düşən ürəklər -
Könüllər abad olur.
Yaşıllaşıb yenə də,
Təbiət cuşa gəlib.
Nə xoşdur Vətənimə
Bayramlar qoşa gəlib.
İlaxır Çərşənbənin
Bir başqadır növrağı.
Əski dünyadan gəlir,
Onun səsi-sorağı.
Bu bayrama çatan yox,
Girsin bəhsə, yarışa.
Heyran qalmamaq olmur
Bu nəcib yaranışa.
Allahın möcüzəsi,
Görkəzməsi bəlkə də.
Hələ belə bayram yox,
Nə diyarda, ölkədə.

# BAYRAMLARIN SULTANI

Novruz gəlir yurduma
Hər tərəf gül-çiçəkdir.
Az sonra keçəl, kosa
Meydana gələcəkdir.
Hər tərəf işıq saçdı,
Novruz gəldi, sevindik.
Kədər bizdən gen qaçdı,
Şadyanlığa büründük.
Şəkərbura, paxlava,
Şorqoğalı yeməli.
Bayramların sultanı,
Ancaq sənə deməli.
Qoz-fındığın, qovurğan
Ağzı dada gətirir.
Üzərriyin, yovşanın
Qada-bala götürür.
Tonqal çatıb uşaqlar,
Atlanırlar üstündən.
Qorxu yoxdu alovdan,
Göz çıxardan tüstüdən.
"Bənövşə bəndə düşə"
-Bir oyundu məzəli.
Uşaqların sevdiyi,
"Yenə gəldi ənzəli"
Çərşənbələr ard-arda
Mənalıdır hər biri.
Bərəkət simvolusan,
Neçə min ildən bəri.

# NOVRUZ, GƏL

Süfrədə düzüm-düzüm:
Ləb-ləbi, xurma, üzüm.
Plovda qalıb gözüm,
Novruz, gəl ha, Novruz , gəl.
Sənsən parlayan ulduz
Keçəl, kosa, bahar qız.
Qoyma gəl bizi yalqız,
Novruz, gəl ha, Novruz, gəl.
Könül evi viran var
Bəxtindən nigaran var
Aralıqda hicran var,
Novruz, gəl ha, Novruz, gəl.
Xoş niyyətin dolaşsın
Küsülülər barışsın
Bərəkət aşıb-daşsın
Novruz, gəl ha, Novruz, gəl.
Göyərtmişəm səməni
Gözləyirəm il səni.
Tez gəl, sevindir məni,
Novruz, gəl ha, Novruz, gəl.
Burda dağlar baş-başa
Bağ-bağçalar tamaşa
Əlvida dedik qışa,
Novruz, gəl ha, Novruz, gəl.

## Şiruyyə Sərraf

Günəş gülür, fəsl bahar fəslidir,
Bülbül gəlsin, gül başına dolansın.
Təbiət qoynunu açıb ellərə,
Ceyran-cüyür çöl başına dolansın.

Xoş havalı, xoş səfalı dağların,
Həm vəfalı, həm səfalı dağların,
Gül-çiçəkli, şiş qayalı dağların,
Qoy kükrəsin, sel başına dolansın.

Aşığın meydanı xoş nəfəslərin,
Şirin ləhcələrin, incə səslərin,
Aqil kimsələrin, comərd kəslərin,
Neçə belə il başına dolansın.

Qocasından min bir sual alıbdı,
Xoş nəsihət, şirin xəyal alıbdı,
Ellərindən ağıl-kamal alıbdı,
Qoy, Şiruyyə,  el başına dolansın.

Ötüşdü payız-qış, ötüşdü ayaz,
Gündüzün, gecənin ötən çağıdır.
Oyandı təbiət, gəldi xoş bahar,
İlkin bənövşənin bitən çağıdır.

Tonqallar alışır, uşaq başında,
Süfrələr açılır, qonaq başında,
Axır çərşənbədə bulaq başında,
Həsrətin vüsala yetən çığıdır.

Qız-gəlinlər bir otağa yığışır,
Çatma qurur, iynə vurur, baxışır,
Ay Şiruyyə, küsülülər barışır,
Gileyin, qeybətin bitən çağıdır.

***

Qoynu tər qoxulu göy yaylaqlarda,
Təbiət insanı hala döndərir.
Toplayıb başına eli, obanı,
Bulaqlar suyunu bala döndərir.

Deyir nəğməsini ötür bənövşə,
Lalələr bayraqdır, sancılıb döşə,
Süsənli-sünbüllü, hər cənnət guşə,
Halımı bir özgə hala döndərir.

Dağlara bax, ətək xalı, zirvə qar,
Şiruyyəni dilə tutub xoş bahar,
Payız vaxtı köçüb gedən durnalar,
Təzədən köçünü elə döndərir.

*Nokəri*

# YAZ GƏLİB

(Əfsanəyə görə qaranquş daim Ayətəl-Kürsü oxuyur)

Yaz gəlib boyanıb yaşıla çəmən,
Tumurcuq bağlayıb bağda yasəmən,
Bülbül dil açıb söylədi həmən,
Xoş ola halimə xoş Bahar gəlib,
Çöllərin bəzəyi durnalar gəlib.

Canlanır təbiət,gəlibdir cuşə,
Kolların dibində nazlı bənövşə,
Cavanlar əldə gül gəlib görüşə,
Yarını gözləyir durub intizar,
Nə gözəl fəsildir bu fəsli Bahar.

***

Qaranquş qonubdu damların üstə,
Oxuyur "Kürsü"*-nü necə ahəstə,
Bülbül ahı-zarda,ürəyi xəstə,
Söyləyir İlahi yetir yarıma,
Şəfa ola mənim ahi-zarıma.

# HACI HƏSƏN HÜSEYNİ

1970-ci il aprel ayının 25-də Zəngilan rayonunun Sobu kəndində dünyaya göz açıb. Azərbaycanın ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə könüllü iştirak edib, ağır güllə yarası alıb. Uzun müddət yataq xəstəsi olub. Hazırda I qrup Qarabağ müharibəsi əlilidir və Xətai rayon Əlillər Cəmiyyətinin üzvüdür. "Müharibə veteranı" və "Milli ordu 100 il" medalları ilə təltif olunmuşdur.

Bakı İslam Universitetini bitirib, islamşünasdır. "Qızıl Qələm", "Xalqın Nüfuzlu Ziyalısı", "Azərbaycan Bayağı Mükafatı" və "Ziya" fəxri diplomları, "Xətai" və "Nəsimi" Ali Media Mükafatarı ilə təltif olunmuşdur. "Paklıq" qəzetinin baş redaktorunun müavinidir. "Həkəri" qəzetinin dini işlər üzrə şöbə müdiridir. "Aşıq Qurbani" məclisinin üzvüdür. "Olaylar", "İki sahil", "Nəbz", "Dirili Aşıq Qurbani", "Təzadlar", "Hüquq və media", "Uca Zirvə", "Əsrin Ziyalıları", "Paklıq", "Bütöv Azərbaycan", "Dərələyəz" qəzetlərində, "Dua və ibadət", "Qızıl Zəngilan", "Xəzan" və "Qarapapaqlar" adlı ədəbi-bədii jurnallarda məqalələri dərc olunur.

"Parlaq Ulduz", "Xuda Hüseynin (ə) aşiqi", "Ya Əli", "Gizli qalmış xəzinə", "Həzrət Əli (ə) müxtəlif baxışlarda", "Sığın Haqq Dərgahına (məqalələr toplusu I-II cildlər)", "Bismilləh" ayəsinin incə görüntüləri və "Bə" hərfinin altında olan nöqtənin sirri", "Ariflərin Haqqa qovuşma məqamı (Şəriət, Təriqət, Mərifət, Həqiqət)", "Həzrəti Rüqəyyə (s.ə), "Ya Zəhra (s.ə) nəzərin ayırma bizdən", "İmam Rza (ə) müxtəlif baxışlarda", "Müqəddəs Zilhiccə bayramları"və "Nəsimidən Nəsimlər-1" adlı elmi tədqiqat əsərlərinin müəllifidir.

# İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT

1. Qurani-Kərim Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov; V.N.Məmmədəliyev. Bakı-2005.
2. Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017
3. «Nəhcül-bəlağə»Toplayanı Seyyid Rəzi.(Tərcümə və şərhi)II cilddə -Bakı-2017.
4. Ayətullah Üzma Seyyid Əli Sistani "İzahlı şəriət hökmləri" Bakı-2017.
5. Əllamə Məclisi «Biharul - Ənvar»
6. Seyyid Haşim Rəsuli – Məhəllati «Peyğəmbərlərin həyatı» «Əndişeye – Hadi» nəşr. 2010
7. Nizamül – Mülk «Siyasətnamə» Bakı – 1990
8. Mahir Şəkərov «İslamda vardır» Bakı - 2017
9. Ə.Xəqani Şirvani «Seçilmiş əsərləri». Bakı «Yazıçı» 1984.
10. Nizami Gəncəvinin «Xəmsə».Bakı «Gənclik»1981.
11. Ş.İ.Xətai «Keçmə namərd körpüsündən» Bakı, «Yazıçı»-1988.
12. M.Füzuli «Seçilmiş əsərləri».Bakı «Yazıçı» 1984.
13. S.Ə.Nəbati «Seçilmiş əsərləri». Bakı «Yazıçı» -1985
14. S.M.Şəhriyar «Heydər babaya salam» Bakı - 2000
15. Axund Hacı Soltan «Duayi-Heydəri və ya Həzrət Əli (ə) Zirvəsinə bir baxış» Bakı «Tural-Ə»NPM-2002
16. Axund Hacı Soltan «Həzrəti-Əli(ə) və dünya ədəbiyyatı»Bakı «Tural-Ə»NPM.2001
17. Aşıq Alı. "Nə qaldı". Bakı-2020.

18. Aşıq Bəhmən Göyçəli «Könlüm vətən arzular» Bakı 1999
19. Kamil Vəliyev. Elimizdən, obamızdan. Bakı "Gənclik"-1980.
20.Azərbaycan folkloru antologiyası, XIII, Şəki-Zaqatala folkloru. Bakı-2005.
21.Masallı folklor örnəkləri. Bakı-2013.

**Məqalələr**

1. Axund Hacı Soltan Hüseynqulu oğlu «Xıdır Nəbi» bayramı
2. «Xıdır Nəbi bayramı» sosial şəbəkələrdə
3. Yusif  Dirili «İlaxır çərşənbəsi Yel çərşənbəsidir, yoxsa . Torpaq çərşənbəsi?»
4. Flora Xəlilzadə «Bahar nə xoş gəlir»
5. Dilbər Ağayeva «Yaran Suvar – Şəfəq bayramı»
6. Natiq Rəhimov «Təbiətin bayramı »
7. İradə Sarıyeva «Azərbaycan kino sənətində Novruz bayramı »

# MÜNDƏRICAT



# BƏNÖVŞƏNİ

# BAYRAMA HƏSR OLUNMUŞ ŞEİRLƏR